MX 29/1

**Müəllif:** Əbu Cəfər Əhməd b. Məhəmməd ət-Təhavi
**Şərhçi:** prof. Məhəmməd b. Abdurrəhman əl-Xumeyyis
**Türkçədən çevirən:** Fərahim Sələfi
**Redaktor:** Ramil Həsən
**Kompüter və dizayn:** Azər Qurbanov

شرح العقيدة الطحاوية الميسر
د. محمد بن عبد الرحمن الخُميّس

**Məhəmməd Xumeyyis**
Təhavi əqidəsinin asanlaşdırılmış şərhi, 2004, 144 səh.

**Azərbaycan dilinə çevrilmiş bu əsərin**
**Əsası kimi istifadə olunmuşdur:**
**«Gencler için akaid dersleri. Tahavi şerhi»,**
**Guraba, İstanbul, İkinci nəşr, 2001.**

Əsilində heç bir şey insanı, bu dünyada qazanacağı şan-şöhrəti və əməllərinə görə, yaradılış hikməti və axirət aləmində *alacağı əvəzlə* bilavasitə bağlı olan*, əqidə mövzusu qədər* maraqlandırmır. Buna baxmayaraq, insanların əksəriyyəti bu mövzuya ya əhəmiyyət vermir, ya da yanlış məlumatlandırılmış olurlar.

İş elə gətirib ki, bu həyati mövzuda həqiqəti axtaranlara doğrudan da rəhbərlik edə bilən və İslam millətinin ilk dövrü qaynaqlarına məxsusluğunun özəlliyini özündə əks etdirən bir sıra əsərlər hal-hazırda əlimizdədir. Qiyamətə qədər Qurana, Peyğəmbərimizin Sünnəsinə və onlara istinad edərək, həmin əsərləri öz həyat mənbəyinə çevirməsi millətimiz üçün qaçılmazdır.

Məhz belə bir əsəri, İslam millətinin başlanğıcı olan saleh sələflərin əqidəsini təhrif etmədən müsəlman bacı-qardaşlarımızın bəhrələnməsindən ötrü təqdim etməklə, bidət və xürafatdan uzaq olan əhli Sünnə və camaat əqidəsini, yaxından tanış olmaları üçün insanlarımızın mühakiməsinə veririk. Hər kəs bilir ki, çayın mənbəyinə yaxınlaşdıqca, o daha şəffaf olur və gur axır.

132654-07
MX 29-1 ----------------
10-04(07)

# MÜNDƏRİCAT

# REDAKTORDAN

Həmdsənalar bütün məxluqatı **Özünə** ibadət etmək üçün yaradan aləmlərin **Rəbbinə** məxsusdur. Uca **ALLAH Ona** itaəti yaradılanların öhdəsinə buraxmadı. Əksinə onlara insanları zülmətdən nura çıxaran kitablar və peyğəmbərlər göndərdi. Verilən əmanəti layiqincə çatdıran sonuncu peyğəmbər Məhəmmədə, **Onun** çağırışına «Eşitdik və itaət etdik» - deyə cavab verən əhli beytə, əshabələrə və onların yolunu sədaqət və ixlasla davam etdirən hər bir müsəlmana **ALLAH**ın salavatı və salamı olsun!

Tərcüməçi tərəfindən İslamın tanınmış siması sayılan Əbu Cəfər Təhavinin «Əqidə» əsərinin Azərbaycan dilinə çevrilməsi müsəlman bacı-qardaşlarımız üçün dəyərli bir töhfədir. Belə əsərlərin redaktə edilməsinin bir sıra xüsusiyyətləri var ki, bu da müəyyən özəlliklərlə bağlıdır. Əvvələn kitab türk dilindən tərcümə edilmiş olduğu üçün onu ərəb əsli ilə müqayisə etmək zəruriyyəti qarşıda dururdu. Son dövrdə bu dildən sürətlə çevrilən dini kitab və kitabçalar içərisində bir sıra yazılar da var ki, öz ərəb orjinalından xeyli fərqlənir, onlarda az da olsa qüsurlara yol verilir. İslam əqidəsi mövzusunda olan əsərlərdə isə belə qüsurlara da yol verilməməlidir. Məhz buna görə, hörmətli Fərahim Sələfinin tərcüməsinə diqqətlə yanaşaraq onun ərəb orijinallığını qorumağa çalışdıq. Bununla yanaşı qeyd etməliyəm ki, ana dilimizə ilk dəfə tərcümə edilmiş «Təhavi əqidəsinin asanlaşdırılmış şərhinin» ayrı-ayrı qüsurlardan tamamilə uzaq olmasını iddia etmək olmaz.

İlkin olaraq tərcümələri əsərin orijinalı ilə müqayisə etdik. Əsaslandığımız əsli nüsxə ər-Riyad şəhərində yerləşən «Dərul-vətən» yayım evi tərəfindən 1414-cü hicri ilində nəşr edilmişdir. Redaktə zamanı aşağıdakı məqamlara diqqət yetirilmişdir:

1)Qarşıya çıxan ayə və hədislər əsli mənbələrə uyğun olaraq yoxlanılmışdır.

2) Redaktə zamanı, türk mütərciminin ixtisar etdiyi kəlimə və ya cümlələr yenidən tərcümə edilərək əsərə daxil edilmişdir. Məsələn, orijinal əsərdəki «**LÜĞƏT**» qisminın ixtisar edilməsi,

şərhçi prof. M. Xumeyyisin lüğət izahlarının imam Təhavinin sözləri ilə qarışmasına səbəb olmuşdur.

3) Bəzi hallarda türk tərcüməçisi ilə razılaşmayaraq sərbəst tərcüməyə üstünlük verilmişdir.

Əsərdə aparılan bu və ya digər düzəlişlərlə tanış olmaq üçün sətiraltı qeydlərə xüsusi diqqət yetirilməlidir.

Şərhçi, tərcüməçi və redaktora məxsus sətiraltı qeydləri hər birinin sonuna (Xumeyyis), (Akın), (F. S.) və (R. H.), mətn daxili izahları isə, mötərizəyə alaraq (red.) yazmaqla bildirdik.

Allahdan, bu əqidə kitabının xalqımıza xeyir gətirməsini diləyirik. O, duaları qəbul edən və onlara cavab verəndir!



# KİTAB HAQQINDA

Əsilində, insanı heç bir şey (bu dünyada qazanacağı şan-şöhrəti və əməllərinə görə) yaradılış hikməti və axirət aləmində alacağı əvəzlə həqiqətən bilavasitə əlaqədə olan ***əqidə mövzusu*** qədər maraqlandırmır. Bunun müqabilində, insanların əksəriy-yəti bu mövzuya ya əhəmiyyət vermir, ya da yanlış məlumatlan-dırılmış olurlar.

İş elə gətirib ki, bu həyati mövzuda həqiqəti axtaranlara doğrudan da rəhbərlik edə bilən və İslam millətinin ilk dövrü qaynaqlarına məxsusluğunun özəlliyini özündə əks etdirən bir sıra əsərlər hal-hazırda əlimizdədir. Qiyamətə qədər Qurana, Peyğəmbərimizin (s.ə.s.) Sünnəsinə və onlara istinad edərək həmin əsərləri həyat mənbəyinə çevirməsi millətimiz üçün qaçılmazdır.

Məhz belə bir əsəri, İslam millətinin başlanğıcı olan saleh sələflərin əqidəsini təhrif etmədən müsəlman bacı-qardaşlarımızın bəhrələnməsindən ötrü təqdim etməklə, bidət və xürafatdan uzaq olan əhli Sünnə və camaat əqidəsini insanlarımızın mühakiməsinə təqdim edirik. Hər kəs yaxşı bilir ki, çayın mənbəyinə yaxınlaşdıqca, o daha şəffaf olur və gur axır.



# BİR NEÇƏ SÖZ

İslam əraziləri 20-ci əsrin başlanğıcında kafirlərin işğalına məruz qalmış, şirkə və zülmə əsaslanan ideoloji hərakatların nəticəsi olaraq cəmiyyətlərə nadanlığın, biliksizliyin aşılanmasına böyük səy göstərilmişdir. İnsanların istək və arzularından doğan ideoloji və praqmatik nəzəriyyələrin yaşayışa hakim kəsilməsi üçün güclü mübarizə aparılmış və münaqişələr törədilmişdir. Beləliklə, bütün gerçək dəyərlər alt-üst edilmiş, insanlar həqiqəti tapmaqda aciz qalmışlar.

Müşriklərin və kafirlərin bu yöndə göstərdikləri səyləri nəticəsində böyük həcmdə nadanlıq, cahillik inanclarının və adətlərinin hökm sürməsi şərtlənmişdir. Bütün bu imkansızlıqlara baxmayaraq müsəlmanların mübarizəsi və səyləri nəticəsində yenidən cücərməyə və qol-budaq atmağa başalayan **İslam oyanışı** bütün müsəlmanlara bir müjdə, həm də yeni nicat mənbəyi olmuşdur. Bu şaxələrin gözəl meyvələr verə bilməsi, bütün bəşəriyyətə o sarsılmaz müjdəni təqdim etməsi ancaq və ancaq saf və təmiz bir əqidə zəminində mümkündür. Buna görə, indiki dövrümüzdəki bərpaçı nəslinin əqidəsini bir sıra təxribatlardan qorumaq və onların şüuruna həqiqi tövhidi, əhli Sünnə və camaat əqidəsini aşılamaq zəruriyyəti yaranmışdır ki, bu nəsil əsil doğru yolla gedə bilsin. Bu, müasir intibah (oyanış) nəsli eyni zamanda həm də avam kütlənin şüurunu bidətdən, xürafə və ləkələrdən təmizləməlidir ki, meydana həqiqi İslam milləti gəlsin.

Bu günümüzdəki İslam intibahı (renesansı) hərakatının doğru və sağlam istiqamət götürməsi üçün cəmiyyətin əqidəsinin təhriflərdən islah edilməsi zəruri olan İslam təlimi verən mütəxəssislərin də diqqət yetirdiyi və üzərində böyük maraqla işlədikləri bir sahədir və onlar bu meydanda çalışmağı öz üzərlərinə götürmüşlər. İslama sonradan əlavə edilən şeylərin ondan təmizlənməsi, əsil dinin üzə çıxması və habelə, İslam millətinin meydana gəlməsi üçün çoxlu səylər göstərilməlidir.

Rəbbimizin bizə bağışladığı saysız-hesabsız nemətlər içərisində ən seçiləni, şübhəsiz ki, İslamdır (Bizi doğru yol olan

hidayət üçün yaratmasıdır.). İslam elmləri içərisində Əqidə elmi bütün dini prinsiplərin təməlini təşkil etməsi baxımından ən şərəfli elm olaraq qəbul edilib. Əqidə sahəsində Allahın Peyğəmbəri (s.ə.s.) ilə onun əshabələrinin ardıyca getdiyi yolu izləyənlərə «əhli Sünnə və camaat» adı verilmişdir.

Etiqad fərqlərinin artıq hökm sürdüyü hicri təqvimi ilə dördüncü əsrin əvvəllərində əhli Sünnə əqidəsini müdafiə edənlərin ən yuxarı başında imam Təhavi özünə yer etmişdir. Təhavinin əqidə kitabının əhli Sünnə əqidəsinə aid olması barədə millətin mötəbər alimləri və hüquqşünasları yekdil rəy vermişlər. Bizim də bu nəfis və seçilmiş kitaba müraciət etməyimizin səbəbi bundadır.

Sünnə əhli dedikdə, Allahın Peyğəmbərinin (s.ə.s.), onun əshabələrinin və onların ardıyca gedən alimlərin yolu və əqidəsinə sadiq olanlar nəzərdə tutulur. İmam Təhavi də onlardandır. Təhavi əqidəsi Hənəfi əqidəsinin ən etibarlı qaynaqlarından biridir. Təvildən[*], təşbihdən[**], təmsildən[***], tətildən[****] və təcsimdən[*****] uzaqdır. Təmiz və saf bir əqidədir.



---

[*] *əsassız yozum və təfsirlər verməkdən*

[**] ***ALLAH**ı məxluqlara oxşatmaqdan*

[***] ***ALLAH**ın mislində kiminsə olduğunu iddia etməkdən*

[****] ***ALLAH**ın ad və sifətlərini inkar etməkdən*

[*****] ***ALLAH**a cism verməkdən*

# İMAM TƏHAVİNİN HƏYATI

**Adı (təxəllüsü):** Əbu Cəfər Əhməd b. Muhəmməd b. Sələmə əl-Əzdi ət-Təhavidir.

**Təvəllüdü və təhsili:** Hicri 239-cu ildə Misirdə anadan olmuş və elə orada da elmi təhsil almışdır. Onun ilk müəllimi atası Əhməd b. Muhəmməd b. Sələmədir. Yanında ən çox təhsilini artırdığı müəllimi isə dayısı İsmail İbn Yəhya əl-Məzənidir. Bu şəxs də imam Şəfiinin ən yaxın və ən fiqhşünas dostu və tələbələrindən biri idi. İmam Təhavi təhsil aldığı illər ərzində ölkəsinin və əcnəbi məmləkətlərin bir çox alimləri tərəfindən dərs almışdır.

Qahirəyə gələn böyük alimlərlə görüşmək imkanını tapan Təhavi onların elmindən bəhrələnmişdir.

**Təhavinin müəllimləri və elmi dərəcəsi:** Təhavinin elmi təhsil aldığı 300-dən çox müəllimi olmuşdur. Elm əhli olan müəllimlərinin bir çoxu Təhavini tərifləmişlər. Misirlilərdən İbn Yunus belə demişdir: «Təhavi etibarlıdır, fiqhşünasdır, alimdir. Onun kimi bir elm adamı olmamışdır»[1]. Bizcə bu şəhadət imam Təhavinin elmi dərəcəsini müəyyən etməkdən ötrü yetərlidir. Çünki İbn Yunusun sözü misirlilər üçün ən mükəmməl sözdü. İmam Zəhəbi isə «Tarixul-Kəbirində» belə deyir: «Şəriət alimidir, mühəddisdir, hafizdir, böyük İslam alimlərindən biridir». İbn Kəsir də «əl-Bidəyə vən-Nihəyə» kitabında belə demişdir: «Etibarlıdır, mühəddisdir, hafizdir və böyük idarəetmə qabiliyyətinə malik, nümunəvi bir alimdir». Eyni sözü İbn Əsir də «Lubəb»-də deyir. Bu deyilənlərə bir çox digər İslam alimləri də qoşulur.

İmam Təhavi əvvəl Şafii məzhəbində olmuş və sonradan Hənəfi məzhəbini üstün tutmuşdur.[2] Bu meylinin səbəbi, o zaman nadanların hənəfi məzhəbinə basqınlarıyla bağlı olduğu deyilsə də, əslində səbəbin – müəllimi və dayısı olan imam Məzəninin,

---

[1] *Tarix, İbn Əsakir, 7/368*

[2] *Söhbət namaz, oruc, zəkat və sairə bu kimi ictihada və qiyasa icazə verilən fiqhi məsələlərdən gedir. (R.H.)*

məsələlərin araşdırılmasında daima böyük imam Əbu Hənifənin kitablarına müraciətlə tədqiqatlarını aparması ilə bağlı idi.

Ancaq bu meyl nadancasına, təəssübkeşliyə görə və quru bir təqlid xatiri üçün deyildi. Çünki imam Təhavi müctəhid bir alim idi. Dəqiq söz harada idisə, o, Əbu Hənifə metodu ilə, doğru olanı mənimsəyirdi.

Təhavinin elmi gücü haqqında deyilənlərlə yazdığı (fiqh, əqidə, hədislərdəki ziddiyyətlər və hökmlər haqqında bənzəri olmayan) əsərlər onun qiymətini açıq-aşkar bildirir.



# ƏSƏRLƏRİ

1-**əl-Əqidətul-Təhaviyyə** (əlinizdəki şərhini oxuduğunuz əsər).

2-**Məanil-əsər.** Bu kitabda fiqh məsələləri mənbələri və dəlilləri ilə verilmişdir.

3-**Muşkulul-əsər**. Təhavi bu əsərində hədislərdəki ziddiyyətləri araşdırmışdır. Öz dövründən əvvəl yazılanlarla və özündən sonra yazılanlarla müqayisə edildikdə, bu əsər Təhavinin hədis sahəsindəki məlumatlılığını çox aydın bir şəkildə meydana çıxardır. Təhavi ziddiyyətli görünən hədisi rəvayət edənləri verir, onları tədqiq edir, mövzu ilə bağlı ayələri misal gətirir, lüğət qaydalarını tətbiq edir, ayələrin nazil olması və hədislərin varid olması səbəblərini açıqlayır və nəticədə müşkülün (ziddiyyətin başa düşülməməsinin) aradan qaldırılmasında anladığı mənanı ustalıqla və ağıllı tərtibatla təqdim edir, məsələni havadan asılı vəziyyətdə qoymur.

4- **Muxtəsər fil-Fiqh alə furuil-Hənəfiyyə**. Bu əsərdə Hənəfi məzhəbinə görə fiqhi məsələlərə dair olan hədisləri ən səhih rəvayətlərinə, anlaşıqlığına və fitva baxımından ən qüvvətlilərinə əsaslanaraq özünəməxsus bir qaydada toplamışdır. Bu Hənəfi məzhəbində ilk yazılan Müxtəsərdir (hədis toplusudur).

5- **Sunənuş-Şəfii.** Bu əsərdə dayısı və müəllimi Məzəninin imam Şəfiidən eşitdiyi hədisləri toplamışdır.

Bu əsərin İslam dünyası üçün ən böyük əhəmiyyəti hənəfi aliminin imam Şəfiinin birinci mənbədən aldığı sözlərini və fiqhi görüşlərini toplamasıdır. Bu isə o zamankı alimlərin bir-birlərinə qarşı tərəfkeşlik etmədiklərinin, məzhəblərin isə arzu və istəklərdən qidalanmadığının göstəricisidir.

Təhavinin İslam mənbələrində yayılmış və yayılmamış daha bir çox əsərləri vardır.

Biz burada onun şah əsərləri kimi qəbul edilmiş ən məşhur əsərlərindən bir neçəsini qeyd etdik.

## ÖLÜMÜ

İmam Təhavi hicri 321-ci ildə vəfat etmişdir. Allah rəhmət eləsin, ondan razı olsun, Allahın Peyğəmbəri ilə bir yerdə etsin! Zəmanəmizdəki İslam intibahına nur saçması arzusuyla Quraba Yayınlarında əl-Humeyyisin Təhavi əqidəsinə yazdığı bu şərhi nəşr edirik.

Elə buradaca bütün əsərlərini nəşr etməyimiz üçün yayın evimizə icazə verən hörmətli elm xadimi Doktor Muhəmməd b. Abdurrəhman əl-Humeyyisə də təşəkkürlərimizi bildiririk. Allah ondan razı olsun, işində ona güc və qüvvət versin.

Bu kitabın elm tələbələrinin əlindən düşməyən bir dərs kitabı olmasını arzu edirik, zira, o buna layiqdir. Bizi buna məcbur edən digər bir amil də imam Əbu Hənifəni fiqhdə – əməldə böyük imam kimi qəbul edərək əqidə mövzusunda onun baxışlarından uzaqlaşma nəticəsində yarana biləcək ziddiyyətlərdir. Belə bir səhv addımdan xilas olmağımız, əlbəttə ki, imam Təhavinin: «Bu, imam Əbu Hənifənin etiqadıdır» deməklə hazırladığı əqidə mətnli «Təhavi əqidə»sini öyrənməklə mümkün olacaqdır.

Bu kitabı nəşr etməyimizi bizə nəsib edən Allaha sonsuz həmdüsənalar olsun!



بسم الله الرحمن الرحيم

# ÖNSÖZ

Həmd ancaq **ALLAH** üçündür. Ona həmd edir, Ondan kömək və bağışlanmamızı diləyirik. Nəfslərimizin şərindən, əməllərimizin pisliklərindən **ALLAH**a sığınırıq. **ALLAH**ın hidayətə çatdırdığı kəs, yolundan azdırıla bilməz, yolundan azdırdığı kəsi isə kimsə hidayətə çatdıra bilməz.

Şəhadət verirəm ki, **ALLAH**dan başqa heç bir ilah yoxdur. O, bir və təkdir. Onun şəriki yoxdur. Yenə də şəhadət verirəm ki, Məhəmməd (sallallahu əleyhi və səlləm) Onun qulu və rəsuludur.

***□ Ey iman gətirənlər! ALLAHdan lazımınca qorxun. Yalnız müsəlman olduğunuz halda ölün □ (Ali-İmran, 102).***

***□ Ey insanlar! Sizi tək bir şəxsdən xəlq edən, ondan zövcəsini yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun! [****Adı ilə****] bir-birinizdən [****cürbəcür şeylər****] istədiyiniz ALLAHdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən həzər edin! Şübhəsiz ki, ALLAH sizin üzərinizdə nəzarətçidir! □ (ən-Nisa, 1).***

***□ Ey iman gətirənlər! ALLAHdan qorxun və doğru söz söyləyin! [****Əgər belə etsəniz,****] ALLAH əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs ALLAHa və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə [****Cənnətə****] nail olar □ (əl-Əhzab, 70-71).***

Daha sonra:

Həqiqətən, sözlərin ən doğrusu **ALLAH**ın Kəlamı, yolların ən xeyirlisi Məhəmmədin (s.ə.s.) yoludur. Ən pis işlər isə sonradan uydurulanlardır. Sonradan uydurulub dinə daxil edilən hər şey bidət, hər bidət – azğınlıq və azğınlıq isə atəşdədir.

Bu kitab Əhli-Sünnə və Camaat əqidəsinin, ümmətin fiqh alimlərindən olan Əbu Hənifə ən-Numan b. Sabit əl-Kufi, Əbu Yusuf Yaqub b. İbrahim əl-Ənsari və Əbu Abdullah Məhəmməd İbn-Həsən əş-Şeybaninin məzhəbinə görə, imam Əbu Cəfər ət-Təhavinin təsnif etdiyi əqidə kitabının qısa və xülasə şəklində bir şərhi və açıqlamasıdır. Uca **ALLAH** ona rəhmət etsin, həqiqətən

də çox gözəl və faydalı bir əsər meydana çıxarmışdır. Necə də faydalı olmasın! O, adıçəkilən imamların əqidəsindən bəhs edən ən inanılmış alimlərdəndir. Zira, o, hənəfi məzhəbində çox dərin və əsaslı bir elmi səviyyəyə sahib idi. O, hənəfi imamlarının əqidəsinin təsbit edilməsində inanılmış alimlərin siyahısının başında yer tutur. Çünki o, həm fiqh alimlərinin, həm də mühəddislərin yanında çox etibarlı bir şəxsiyyətdir.

Təhavinin müəyyən etdiyi bu dini təlimlər mətni bütün imamlar tərəfindən qəbul edilmişdir. Buna görə bu şəriət kitabı haqqında bir çox şərh və açıqlamalar yazılmışdır. Bu çalışmaların bir qismi Sünnəyə, bir qismi də kəlamçıların metoduna uyğun olaraq yerinə yetirilmişdir. Bu şərhlərin ən dəyərlisi və ən yararlısı imam İbn Əbil-İzz əl-Əzrai əl-Hənəfinin işidir. O, Təhavinin risaləsinə şərh yazarkən bu üç məsələdə onun baxışlarına aydınlıq gətirmişdir.

1. Təhavi «başlanğıcı olmayan qədim» ibarəsini işlədir. Bu anlayış kəlamçıların[3] uydurmalarındandır. Uca **ALLAH** Onun Özünü və yaxud Rəsulunun (s.ə.s.) Onu adlandırdığı adlardan başqa bir adla adlandırıla bilməz.

2. «Uca **ALLAH** hədlər, qayələr, dayaqdar, orqanlar və alətlərdən uzaqdır» sözü barədə. Bu ifadələr şəriətdə nə isbat, nə də inkar edilmək məqsədilə varid olmuşdur. Əksinə, bu, kəlamçıların uydurmalarındandır. Buna görə də biz, şəriət istilahlarından istifadə etməliyik.

3. «İman – dil vasitəsilə etiraf edilir, qəlblə təsdiqlənir» ifadəsi. Təhavi bu qaydada əməlləri «iman» sözündən kənar tutur. Bu müxtəlif məzhəblərdən olan sələfi alimlərinin razılığa gəldiklərinə uyğun deyildir.

**ALLAH** imam Təhaviyə, İbn Əbil-İzzə və digər imamların hamısına Qurana, Sünnəyə və Əhli-Sünnə və Camaat əqidəsinə xidmət etdikləri üçün rəhmət eləsin.

---

[3] *Kəlam (əl-Kəlam) – dinə deyil, təfəkkürə əsalanan mühakimə. Kəlamçılar -- belə əqidə sahibləri. (F.S.)*

Mən də bu «Əqidə»ni başlanğıc nöqtəsi edən elm tələb-karlarına və başlıca olaraq müsəlmanların hamısına yararlı olması üçün çox qısa bir şəkildə açıqladım.

**ALLAH**dan arzum budur ki, bu kitabımı müsəlmanlar üçün yararlı etsin və qiyamət günü tərəzimin ağır gəlməsi üçün onu yaxşı əməl tərəfinə qoysun! **ALLAH** bütün niyyətlərdən agahdır. O, bizə bəs edər! O, necə də gözəl vəkildir. Dualarımızın sonu – aləmlərin Rəbbi olan **ALLAH**a həmdsəna etməkdir.

**Prof. Məhəmməd b. Abdurrəhman**
**əl-Xumeyyis**



# BİRİNCİ DƏRS

**İmam Əbu Cəfər ət-Təhavi əl-Hənəfi əl-Misri (ALLAH ona rəhmət etsin) deyir ki:**

Bu, ümmətin fiqh alimlərindən sayılan Əbu Hənifə ən-Numan b. Sabit əl-Kufi, Əbu Yusuf Yaqub b. İbrahim əl-Ənsari və Əbu Abdullah Məhəmməd İbn Həsən əş-Şeybaninin (**ALLAH** onlardan razı olsun) əhli-Sünnə və camaat[4] əqidəsinə[5], dinin

---

[4] ***Əhli-Sünnə:*** *Sünnə kəlməsi lüğətdə: yol və həyat tərzi mənalarını verir. İstilahda isə Rəsulullahın (s.ə.s.) yolu və həyat tərzi tərəfdarlarını bildirir. Bu, elmdə, etiqadda, hərəkətdə və sözdə Rəsulullahın (s.ə.s.) yolu və izini tutub getməkdir. Əksi və ya ziddi isə – bidətdir.*

***Camaat: «****Camaat» kəlməsi lüğətdə: toplanmaq, bir yerə yığışmaq mənalarını verir. Bir topluluq hər hansı bir şey üçün bir yerə yığışdıqda onlara camaat deyilir.*

*Bunun əksi isə: təfriqə və ayrılıqdır.*

*Terminoloji mənasına gəlincə, «Cəmaatu´l-müslimin» müsəlman toplumlarıdır ki, bunlar da ümmətin (müsəlman xalqının) sələfləridir. Səhabələr, onlardan sonrakı nəsil və qiyamətə qədər bunların ardıyca gedənlərdir.*

*Əhli-Sünnə camaatı: onlar Rəsulullahın (s.ə.s.), əshabının, tabeinin, tabei-tabeinin (yəni, əshabdan sonrakı nəsilin) etiqad və əməllərindəki üsul və xətləri əsas tutanlardır. Onlar Rəsulullaha (s.ə.s.) tabe olaraq bidətdən uzaqlaşdılar. Bizim də onların yolunu davam etdirməmiz qurtuluş, onlardan ayrı düşməyimiz isə zəlalətə düşməyimizdir.*

*İslam ümmətinin (xalqının) millətlər arasında orta (tarazlaşdırıcı) millət olması kimi, əhli-Sünnə camaatı orta mövqe tutur. İfrata varmaqdan və əhəmiyyətsiz saymaqdan uzaqdırlar. Onlar ümmətin yetmiş üç firqəsi içərisində orta (sabit) yolu tutan yeganə bir firqədir.*

*Əhli-Sünnənin ziddi Əhli-bidətdir. Bunlar beş əsas firqəyə ayrılırlar:*

*1. Xaricilər; 2. Rafizilər; 3. Murciyyə; 4. Qədəriyyə və 5. Cəhmiyyə.*

*Əhli-Sünnənin hikmət vəsfinə sahib olmasının nişanəsi, Əhli-bidətin əksinə, önündəkilərə elm və ədalətlə hökm verməsidir.*

*Əhli-Sünnə alimlərinə görə, əhli-Sünnə istilahı sələfi-salehinlə eyni ölçü və mənadadır. Eyni zamanda onlara əhli-əsər və əhli-hədis də deyilir. Qalib tayfa və İttiba əhli də onlara verilən adlardandır. Bu xüsusiyyətlər ümmətin bütün icmasında sabitdir. (M.E. Akın)*

[5] ***Əqidə:*** *Əqidə, lüğətdə düyün, sağlam bağ, əlaqə anlamlarını verir. Əsas mənada isə iddia ilə, israrla bağlı olmaq anlamını bildirir. Bir yerə yığışmaq*

üsulu və **ALLAH**a iman mövzusu ilə bağlı nəzər nöqtələrinin bir açıqlamasıdır.

**1. ALLAHın birliyi haqqında, Onun köməyi ilə, deyirik ki, ALLAH birdir və Onun şəriki yoxdur.**

## ŞƏRH

Şərik – bir şeydə payı olan şəxsdir.

Uca **ALLAH** hər şeydə birdir. Zatında da, hərəkətlərində də, ad və sifətlərində də birdir.

İbadət olunmasına həqiqətən layiq olan və buna yeganə haqq sahibi kimi təkdir. Bu sadalananların heç birində şəriki yoxdur. Həm də, yaradıcılığında və hökmlərində də şəriki (ortağı) yoxdur.

***□ Bilin ki, yaratmaq da, əmr etmək də Ona məxsusdur □ (Ə□raf, 54).***

***□ ALLAHdan başqa sizə göylərdən və yerdən ruzi verən bir xaliq varmı?! □ (Fatir, 3).***

**ALLAH**ın kainatda xeyir və zərər verməsində, öldürməsində, diriltməsində və bundan başqa hər cür məsrəfi və

---

*lazım gəldikdə insan övladı əminliklə nəyə bağlanırsa, ona əqidə deyilir. Terminoloji mənası: şəksiz, şübhəsiz, qəti və bütün varlığı ilə bağlanılan imana «**ə q i d ə**» deyilir.*

*İslam termini kimi **əqidə**: heç bir şübhə yeri qoymadan **ALLAH**a, mələklərə, peyğəmbərlərə, kitablara, axirət gününə, qədərə (alın yazısına) və Rəsulullahın (s.ə.s.) verdiyi xəbərlərdən məlum olan bütün qeyblə bağlı şeylərə, səhabələrin yekdilliklə bizə çatdırdığı xüsusatlara inanmaq haqqına deyilir.*

*Burada hökmən bildirilməsi lazım gələn bir məsələ də var ki, bu da «əqidə» anlayışı yalnız «islam əqidəsi» kimi nəzərdə tutulduqda əhli-Sünnə əqidəsi olur. Çünki, Kitab və Sünnəyə sadiq olan camaatın məhz əhli-Sünnə olmasına İslam alimlərinin ümumi razılığı vardır.*

*Ancaq əhli-Sünnə, əqidə anlayışını müxtəlif sözlərlə ifadə etmişdir: tövhid, Sünnə, usuliddin, fiqhul-əkbər, şəriət, iman kimi sözlərin hamısı əqidə mənasındadır. (M.E. Akın)*

tədbirlərində heç bir şəriki yoxdur. Həm də Onun nə adlarında və nə də sifətlərində şəriki yoxdur.

Bir qul cürbəcür şirklərin hamısından qurtularaq bunların əksi və vacibi olan tövhidin bütün tələblərini yerinə yetirmək şərtiylə Onu rububiyyətində, uluhiyyətində, adlarında və sifətlərində tənha saymadıqca, onun tövhidi tam olmaz. Qul heç bir məxluqatı **ALLAH**a məxsus olan bir sifətlə vəsf edə bilməz. Onu uluhiyyətində tək hesab edər və ibadətin hansı növü olursa olsun, Ondan başqasına ibadət etməz.

***Biz yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyirik!** **(Fatihə, 5).***

***Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım!** **(Zariyat, 56).***

**2. Onun misli yoxdur**.

**3. Heç bir şey Onu aciz qoya bilməz. Yəni heç nə Ona güc gəlib Onu aciz edə bilməz.**

İlah, məbud – ibadət edilənlərdir. Amma, təkcə Rəbb olan məbuddur. Hər insanın ilahı – ibadət etdiyidir.[6]

**4. Ondan başqa ilah yoxdur.**

## ŞƏRH

Bu, tövhidin təməl qaydalarındandır. ***Ona bənzər heç bir şey yoxdur. O, eşidəndir, görəndir!** **(Şura, 11)*** - deyə etiqad

[6] *Nəzərinizə çatdırım ki: «**Yəni heç nə Ona güc gəlib Onu aciz edə bilməz.** İlah, məbud – ibadət edilənlərdir. Amma, təkcə Rəbb olan məbuddur. Hər insanın ilahı – ibadət etdiyidir» - sözləri, imam Təhaviyə deyil, şərhçi pr. Məhəmməd Xumeyyisə məxsusdur. Türk tərcüməçisinin bu və digər lüğət izahlarına verilmiş **«LÜGƏT»** başlığını ləğv etməsi, onların imam Təhavinin sözləri ilə qarışmasına səbəb olmuşdur. Deyilə bilər ki, Təhavinin sözləri qalın şriftlə verilmişdir. Lakin göründüyü kimi, pr. Xumeyyisin izahından sayılan: «**Yəni heç nə Ona güc gəlib Onu aciz edə bilməz»** - sözləri də eyni şəkildə yazılmışdir. (R.H.)*

edilməlidir. O, yaratdıqlarından heç birinə bənzəməz. Yaratdıqlarının da heç biri Ona nə zatında, nə hərəkətlərində, nə adlarında, nə sifətlərində və nə də hüququnda bənzəməz. Heç bir şey Ona güc gəlib Onu aciz qoya bilməz. O, istədiyi hər şeyi yaratmağa qadirdir.

□ ***Bir şeyi istədiyi zaman ALLAHın buyuruğu ona ancaq: «Ol!» - deməkdir. O da dərhal olar*** □ ***(Yasin, 82).***

Heç bir şey Ona güc gələ bilməz və heç bir şey Onu gücdən sala bilməz: □ ***Göylərdə və yerdə ALLAHı aciz edə biləcək heç bir şey yoxdur. Həqiqətən, O, bilən və qadirdir!*** □ ***(Fatir, 44).***

Bu, Onun qüdrətinin tamlığından və qüdrət kamalındandır. Nəyi istəmişsə, o da olmuşdur. Nəyi istəməmişsə, o olmamışdır. Məhz bu Onun rububiyyətinin kamilliyindəndir.

«Ondan başqa ilah yoxdur» kəlməsi tövhidin özüdür. Bütün peyğəmbərlərin çağırışı budur: □ ***Biz hər ümmətə: «ALLAHa ibadət edin, Tağutdan çəkinin!» - deyə peyğəmbər göndərmişdik*** □ ***(ən-Nəhl, 36).***

**ALLAH**ın bu kəlamının mənası «həqiqətən **ALLAH**dan başqa ibadət ediləcək heç bir tanrı yoxdur» deməkdir. Çünki yaradan, ruzi verən, mülkün sahibi və idarə edən Odur. Beləcə, tək O, başqası tərəfindən heç bir şəriki olmamaq şərti ilə, bütün ibadətlərə haqqı Olandır. Ondan başqa kimə ibadət edilsə belə batil yolla ibadət edilmiş olacaq.

□ ***Bu belədir. Çünki ALLAH haqq, [****müşriklərin****] Ondan başqa ibadət etdikləri isə batildir*** □ ***(əl-Həcc, 62).***

Elə buna görədir ki, onlardan heç biri nə hökm vermək, nə sahib olmaq haqqına, nə də hər hansı bir idarə etmə qüdrətinə malik deyillər.

Bu ifadədə **ALLAH**dan qeyrisinə ibadət edilməsinin təkzib olunması və yeganə olaraq **ALLAH**a ibadət isbata yetirilir. Bu sözdən belə çıxır ki, **ALLAH**dan başqasına ibadət etmək küfrdür. Çünki ibadət məhz **ALLAH**a yönəldilməlidir. Bu, üluhiyyət tövhididir.

## Xülasə

**ALLAH** təala həm zatı və həm də ad və sifətləri etibarı ilə vahiddir (birdir). İbadət edilməyə (übudiyyətə) yeganə haqq sahibi olan da yalnız Odur. Bunların heç birində **ALLAH** yaratdıqlarından hər hansı birinə bənzəmir. Onun gücü hər şeyə çatır. Heç kim Onu aciz qoya və Ona güc gələ bilməz. Həm də Ondan başqa heç kimin ibadət olunma haqqı yoxdur.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. **ALLAH**ın vəhdaniyyəti nədir?
2. Tövhidin üç növü hansılardır?
3. Şirkin üç növü hansılardır?
4. Bütün peyğəmbərlərin ona dəvət etdiyi hansı sözdür?



## İKİNCİ DƏRS

**5. ALLAH başlanğıcı olmayan qədimi və sonu olmayan daimidir.**

**6. ALLAH heçliyə uğrayıb yox ola bilməz.**

**7. Ancaq Onun istədiyi olur.**

«Qədimi» – özündən başqa hər şeydən öncə mövcud olan deməkdir.

«Heçliyə uğrayıb yox ola bilməz» isə, nə məhv olmur və nə də qeybə çəkilmir» mənasındadır.[7]

## ŞƏRH

«Qədim» sözü **ALLAH** təalanın adlarından deyil. Burada məqsəd Onun varlığının əvvəli və başlanğıcının olmamasıdır. O, həm də sonu olmayacağa qədər «daimi» və «baqidir»[8]. Bu, **ALLAH** təalanın məhz aşağıdakı kəlamının mənasından irəli gəlir:

 ***Əvvəl də, axır da,...Odur*** ***(əl-Hədid, 3).***

*«Əvvəl»* – özündən öncə heç kimin olmamasıdır. *«Axır»* – isə, Ondan sonra heç bir kimsənin, heç bir şeyin olmamasıdır. Bunu **ALLAH**ın Peyğəmbəri (s.ə.s.) də belə izah etmişdir.

«Heçliyə uğrayıb yox olmaz» ifadəsi, **ALLAH**ın buyurduğu kimi,  ***Yer üzündə olan hər kəs fanidir. Ancaq əzəmət və kərəm***

---

[7] *Qeyd edim ki: «Qədimi» – özündən başqa hər şeydən öncə mövcud olan deməkdir. «Heçliyə uğrayıb yox ola bilməz» isə, nə məhv olmur və nə də qeybə çəkilmir» mənasındadır – sözləri də, prof. M. Xumeyyisə məxsusdur. İrəlidə qeyd edildiyi kimi buna səbəb, türk tərcüməçisinin kəlimələrin izahı üçün qoyulmuş «**LÜĞƏT**» başlığını ixtisar etməsidir. (R.H.)*

[8] *Əbədi qalandır. (F.S.)*

***sahibi olan Rəbbinin zatı[9] baqidir  (ər-Pəhman, 26-27)*** - mənasını bildirir.

*** ALLAHdan[10] başqa hər şey məhvə məhkumdur  (əl-Qəsəs, 88).***

**ALLAH** təalanın yaratdığı hər nə varsa, fanidir. O, onları yox edir, Özü isə əbədi qalır. O, bütün şeylərin yox olmasından sonra yenə qalır. «Ancaq Onun istədiyi olur». **ALLAH** təalanın istədiyinə gücü çatır.

*** Lakin ALLAH Öz istədiyini edər  (əl-Bəqərə, 253).***

**ALLAH** təala bir işi görmək istədiyi zaman, əgər bütün yaratdıqları onu istəməsələr də, onu edər. Yox, əgər **ALLAH** bir şeyi istəməzsə, insanların hamısı bir yerə yığışsa belə onu edə bilməzlər. Məhz bu, qaçılması mümkün olmayan alın yazısıyla bağlı *«qaçılmayacaq iradənin»* təcəssümüdür. Bu kainatda törəyən xeyir və şər işlər ancaq Onun arzusuyla baş verir. Onun iradəsinə kimsə qalib gələ bilməz. **ALLAH** nəyi istəmişdirsə, o da olmuşdur. Nəyi istəməmişdirsə, o da olmamışdır. Bunun sübutları saysız-hesabsızdır.

**8. Xəyal və düşüncələrlə ALLAH dərk edilməz. Yəni, kim necə düşünürsə düşünsün, düşüncələr Ona yetişməz.**

**9. ALLAH insanlara oxşamır. Yaradılmış nə varsa Ona bənzəməzlər.**

**10. Həyydir (diridir), ölməz; Qəyyumdur, yuxuya getməz.[11] «Qəyyum» - Daimidir, hər şeyi əhatə edən və hər şeyə gücü çatandır. Hər şeyi qoruyur. Qaimdir[12].**

---

[9] *Əsərin türk dilindəki tərcüməsində bu ayə,* ***"(Yer) üzerinde olan her şey fanidir. Celal ve ikram sahibi olan Rabbinin yüzü ise bakidir"*** *(yəni,* ***"Yer üzündə olan hər kəs fanidir. Ancaq əzəmət və kərəm sahibi olan Rəbbinin üzü baqidir"****) kimi verilmişdir ki, bu da həm dilçilik, həm də təfsir baxımından orijinala daha uyğundur. (R.H.)*

[10] *Eynilə bu ayə də, türk dilindəki tərcümədə* ***"Onun yüzünden başqa her şey helak olucudur"*** *orijinala uyğun şəkildə (yəni,* ***"Onun üzündən başqa hər şey məhvə məhkumdur"*** *kimi) verilmişdir. (R.H.)*

## ŞƏRH

Onun yaratdıqlarından olan kimsə, **ALLAH** təalanın gerçək varlığını öz elmi ilə qavraya bilməz. Əziz və cəlil **ALLAH**  ***Onların elmi isə Onu [**ALLAHın zatını**] əhatə edib qavraya bilməz!***  ***(Taha, 110),*** deyə buyurmuşdur. Zənn, düşüncə, xəyal və təsəvvürlərlə Onu dərk etmək olmaz. Yaratdıqlarından heç kim Onun zatının sirrini bilməz. Çünki O, yaratdıqlarından heç birinə nə zatı, nə adları, nə sifətləri və nə də əməlləri ilə oxşamır. Onun bənzəri yoxdur. O, ölməz diridir:

 ***Yer üzündə olan hər kəs fanidir [**ölümə məhkumdur**]. Ancaq əzəmət və kərəm sahibi olan Rəbbinin zatı[13] bəqidir  (Rəhman, 26-27).***

 ***ALLAHdan[14] başqa hər şey məhvə məhkumdur  (əl-Qəsəs, 88).***

 ***[**Ya Məhəmməd!**] Ölməz, həmişə diri olan ALLAHa bel bağla...  (əl-Furqan, 58).***

O, daima diridir. Ölüm Ona çatmaz. O, Qəyyumdur. Onu nə mürgü, nə də yuxu tutar. Belə olmasaydı kainatın bütün müvazinəti pozulardı. Halbuki, O, mülkiyyətinin sahibidir və hər nə varsa Onun şanını ucaldır.

Bütün bu deyilənlərlə **ALLAH**ı yaratdıqlarına bənzədən Müşəbbihə (**ALLAH**ı xəlq olunanlara bənzədənlər) tərəfdarlarına cavab verilir. Onlar bu sözləri deməklə küfr etmişlər.

---

[11] *Əsərin ərəb orijinalına baxdıqdan sonra aydın oldu ki:*

*- səkkizinci bənddəki:* ***Yəni, kim necə düşünürsə düşünsün, düşüncələr Ona yetişməz***

*- doqquzuncu bənnddəki:* ***Yaradılmış nə varsa Ona bənzəməzlər,***

*- və onuncu bənddəki:* ***«Qəyyum» - Daimidir, hər şeyi əhatə edən və hər şeyə gücü çatandır. Hər şeyi qoruyur. Qaimdir*** *– sözləri imam Təhaviyə deyil, şərhçi prof. M. Xumeyyisə məxsusdur. (R.H.)*

[12] ***Qaim*** *–(ə. قائم) dayanan, ayaq üstə duran; mövcud olan; möhkəm, mətanətli; davamlı, sərt («Ərəb və fars sözləri lüğəti», Bakı, 1985, səh.102). (F.S.)*

[13] *Yeddinci sətiraltı qeydə bax!*

[14] *Səkkizinci sətiraltı qeydə bax!*

**11.** **ALLAH ehtiyacı olmadığı halda yaradır, kömək almadan, çətinlik duymadan ruzi verir. Yorğunluq bilmir.**

**12.** **Qorxu çəkmədən öldürür, gücə düşmədən yenidən yaradır.**

## ŞƏRH

**ALLAH** təala yaratdıqlarını onlara ehtiyacı olduğuna və yaxud onlardan bir kömək ummaq məqsədilə yaratmamışdır. Onları Ona ibadət etsinlər deyə xəlq etmişdir:

***Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım!*** ***(əz-Zariyat, 56).***

**ALLAH** təala insanlara, cinlərə, quşlara, vəhşi heyvanlara, möminlərə, kafirlərə, hər istəyənə dilədiyini verdikdə mülkiyyətindən heç nə əksilmir. Göylərin və yerin yönəldilməsi və idarə olunması Onun əlindədir. Yaratdıqlarını qorxuya düşmədən öldürər.

***ALLAH*** [*əcəli çatan kimsələrin*] ***canlarını*** [*ruhlarını*] ***onlar öldüyü zaman... alar*** ***(əz-Zumər, 42).***

***Heç kəs Onun hökmünü dəf edə bilməz!*** ***(ər-Rə'd, 41).***

***ALLAH gördüyü işlər barəsində sorğu-sual olunmaz; onlar*** [*bütün bəndələr*] ***isə*** [*tutduqları əməllərə görə*] ***sorğu-sual ediləcəklər*** ***(əl-Ənbiya, 23).***

Qiyamət günü ölüləri O dirildir:

***Kafir olanlar öldükdən sonra əsla dirilməyəcəklərini iddia edirlər.*** [*Ya Peyğəmbər!*] ***De ki: «Bəli, Rəbbimə and olsun ki, siz mütləq diriləcəksiniz. Sonra da*** [*dünyada*] ***etdiyiniz əməllər sizə*** ( [*bir-bir*] ***xəbər veriləcəkdir. Bu ALLAH üçün çox asandır!*** ***(ət-Təğabun, 7).***

***Ey Rəbbimiz! Olacağına şübhə edilməyən bir gündə*** [*qiyamətdə*] ***bütün insanları*** [*bir yerə*] ***toplayan Sənsən*** ***(Ali-İmran, 9).***

**ALLAH** təala qiyamət günü, insanları öləndən sonra yenidən yaradır. Bu, Ona görə çətin deyil. Yer üzünü məhv etdikdən sonra səmadan yağış yağdıraraq onu canlandırıb bitkilərlə bəzəyən **ALLAH,** insanları öləndən sonra yenidən diriltməyə qadirdir:

*** Biz ölüləri də [*qəbirlərindən*] belə çıxardıb dirildirik. Bəlkə, düşünüb ibrət alasınız!  (əl-Əraf, 57).***

Onları ilk dəfə yaradan, öldürdükdən sonra da ruhlarını yenidən bədənlərinə qaytarmağa qadirdir. Bu Ona daha çox asandır.[15]

## Xülasə

**ALLAH** təala əzəlidir və əbədidir. Ölməzdir, diridir. Gücü hər şeyə çatır. Xəlq etdikləri kimsələr Onun elmindən, Onun bəyan etdiklərindən başqa heç nəyi dərk edə bilməzlər. O, nə yuxulayır, nə də mürgüləyir. O, yaratdıqları üçün məsuliyyət daşımır. Əksinə O, istədiyini məsuliyyətə cəlb edir.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Qədim **ALLAH**ın adlarından biridirmi ?
2. «Məhz Onun istədiyi olur» nə deməkdir?
3. **ALLAH**ın iradəsinə şərik olan varmı?



# ÜÇÜNCÜ DƏRS

**13. Hal-hazırda və yaratdığlarından da öncə qədim olaraq vardır.** [16]

---

[15] *Türk tərcüməsindən fərqli olaraq əsərin ərəb orijinalında şərhçi pr. Məhəmməd Xumeyyis öz açıqlamalarını aşağıdakı sözlərlə bitirir: "**...Allah (müşriklərin) Ona aid etdikləri sifətlərdən uzaqdır (pakdır) və yüksəklikdə durur**". (R.H.)*

[16] *Türk dilinə uyğun çevrilmiş bu cümləni (yəni, **«Halihazırda ve yarattıklarından önce de kadim olarak vardır»**), əsərin əsli nüsxəsi ilə:*

O, onları yaratdıqdan sonra, yeni bir sifət qazanmamışdır. Yaratdıqlarını yaratmamışdan əvvəl də eynilə bu əzəli sifətləri mövcud olmuşdur. O, indi də bu sifətlərin əbədi sahibidir.

*«Əzəli»* – başlanğıcı olmayan, sonsuz əvvələ malik olandır. *«Əbədi»* – isə sonu olmadan bəqi qalandır[17].

**14. O, nə yaratdıqlarını xəlq etdikdən sonra «Yaradıcı» sifətini, nə də insanları vücuda gətirdikdən sonra «əl-Bəri» adını almışdır. ALLAH bu sifətlərə əzəldən malik idi.**

*«əl-Bəri»* – yaratdıqlarını əvvəlcədən verilmiş yaradılış sözü olmadan xəlq etmiş olduğunu ifadə edir[18].

## ŞƏRH

**ALLAH** təalanın sifətləri xəlq etdiklərini yaratmamışdan öncə Onda daima mövcud olmuşdur. Bu sifətlərin hamısı Onun kamil sifətləridir. Bu sifətlərinin olmamasını və ya yoxluğunu qəbul etmək onları əksiltməkdir. **ALLAH**ın kamil sifətlərindən sonra əksikliklərini təkmilləşdirməsi doğru deyildir. Məsələn, O, insanları xəlq etdikdən sonra «Xaliq» adını qazanmır. Əksinə, bütün sifətləri kimi, «Yaradıcı» sifəti də onları yaratmamışdan əvvəl Onda vardı. Beləcə, Onun sifətləri də Özü kimi əzəlidir. Bu sifətlərin başlanğıcı və heç bir formada sonu yoxdur. Əksinə,

---

مازال بصفاته قديمًا قبل خلقه

*- müqayisə etdikdə, orijinaldan **«sifətləri»** sözünün çıxarıldığı aşkar olundu. Halbuki məhz bu söz, on üçüncü bəndin mahiyyətini ifadə edir. Onun tam tərcüməsi aşağıdakı kimidir: **«Hal-hazırda və yaratdığlarından da öncə sifətləri ilə qədim olaraq vardır»**. (R.H.)*

[17] *Qeyd edim ki: **«Əzəli» – başlanğıcı olmayan, sonsuz əvvələ malik olandır. «Əbədi» – isə sonu olmadan bəqi qalandır»** - sözləri, imam Təhaviyə deyil, pr. Məhəmməd Xumeyyisə məxsusdur. (R.H.)*

[18] *Orijinala baxdıqdan sonra aydın oldu ki: «əl-Bəri» – yaratdıqlarını əvvəlcədən verilmiş yaradılış sözü olmadan xəlq etmiş olduğunu ifadə edir – sözləri imam Təhaviyə deyil, pr. Məhəmməd Xumeyyisə məxsusdur. (R.H.)*

**ALLAH** yaşadıqca Onunla birgə olacaqlar. **ALLAH**ın varlığının da sonu olmayacaqdır.

O, Sübhanəhu və Təala, xəlq etdiklərini yaratmamışdan qabaq da Xaliq sifətinə malikdi. Hətta onları yaratmasaydı belə bu adla adlandırılardı. **ALLAH**ın bu adla çağırılması xəlq etdiklərini əməli olaraq yaratdıqdan sonra meydana gəlməmişdir. Eləcə, «Bəri» adını da məxluqatı xəlq etdikdən sonra almamışdır. O, onları yaratmamışdan da qabaq «Bəri» adına malikdi. Onun adları və sifətləri də zatı kimi qədimdir. **ALLAH**ın Peyğəmbərinin (s.ə.s.) buyurduğuna görə: *«**ALLAH** təala yaratdıqlarının qədərini, göyün və yerin yaradılmasından əlli min il qabaq yazmışdır»*.[19]

**15. O, göylər və yerdəki bütün səltənətləri və onlarda fasiləsiz yaradılan, hər an dirildilib-öldürülən, daima bütün əməlləri idarə olunan və istəyi və iradəsi ilə tərbiyə edilənlər (mərbublar) hələ yox ikən də bütün bunları özündə ehtiva edən «Rəbb» sifətinə malikdi. O, onları yaratmamışdan qabaq «Yaradıcı» adının sahibiydi.**[20]

---

[19] *Müslim, Kitabu'l-Qədər, Babu: Hicaci Adəmə, Musa (2653) Əhməd, Müsnəd, C. 2, səh.169 və digərləri, Abdullah b. Əmrdən «mərfu» (yəni, Peyğəmbərdən nəql edilən isnad – red.) olaraq rəvayət etmişdir. (prof. M. Xumeyyis).*

[20] *On beşinci bəndi əsərin ərəb orijinalı ilə müqayisə etdikdə onun türk dilinə izahlı şəkildə yəni: **"O, gökler və yerdeki tüm mülk ve içindeki her an yaratılıp, her an diriltilip-öldürülen, her an tüm işleri idare olunup, sevk ve idaresi ile terbiye edilenler (merbub) yok iken de bütün bunları içeren «Rab» sıfatına sahipti. O, onları yaratmadan önce de «Yaratıcı» ismine sahipti"** - kimi tərcümə olunduğu aşkar edildi. Ərəb dilində:*

15 – له معنى الربوبية ولا مربوب ، ومعنى الخالق ولا مخلوق .

*- deyə ifadə olunan bu cümlənin izahsız tərcüməsi belədir: **"O, mərbub yox ikən Rəbb, məxluq yox ikən Xaliq idi"**. (R.H.)*

*Rububiyyət:* malik olmaq, yiyələnmək, tədbir görmək deməkdir. *Mərbub:* yaradılan, tərbiyə edilən deməkdir[21].

**16. O, ölüləri diriltdikdən sonra da və diriltməsindən əvvəl də Dirildəndir. Bu adına, onları xəlq etməmişdən malikdi. Yaradan adına da O, xəlq etdiklərini yaratmamışdan öncə malik idi.**

**17. O, gücü hər şeyə çatandır. Hamı Ona möhtacdır. Hər şeyin sonu Ona qayıdacaqdır.[22] O, heç nəyə ehtiyac duymur. *Ona bənzər heç bir şey yoxdur. O, [hər şeyi] eşidəndir, [hər şeyi] görəndir* *(Şura, 11).***

## ŞƏRH

**ALLAH** təala Rəbb sözünün tam mənası ilə heç nəyi yaratmamışdan əvvəl də Rububiyyət sifətinə malik olmuşdur. Beləliklə, O, onları xəlq etməmişdən qabaq da «Yaradıcı» adını daşıyırdı. Bu adların və mənaların hamısı Onun zatında öncədən və sonra da olmuşdur.

**ALLAH** təala, yaratdıqlarını onlar öldükdən sonra, onları ilk dəfə yoxdan necə yaratmışdısa, belə də dirildəcəkdir.[23] O,

---

[21] *Qeyd edim ki: «Rububiyyət: malik olmaq, yiyələnmək, tədbir görmək deməkdir. Mərbub: yaradılan, tərbiyə edilən deməkdir» - sözləri imam Təhaviyə deyil, prof. M. Xumeyyisə məxsusdur. (R.H.)*

[22] *Türk mətninə uyğun tərcümə edilmiş bu cümlədə, يسير («yəsirun» yəni, asan, yüngül) sözü səhvən «qayıdacaqdır», «dönecektir» mənalarında verilmişdir. Ehtimal oluna bilər ki, türk tərcüməçisi يسير (yəsirun) kəliməsindəki "sin" hərfini "sad"la dəyişik salmışdır. Çünki ərəb dilində يصير (yəsıru) feli, «dönür», «qayıdır» mənalarını bildirir. Lakin təəccüblüsü budur ki, əsərin ərəb orijinalında şərhçi prof. M.A. əl-Xumeyyis, يسير (yəsirun) kəliməsinin سهل («səhlun» yəni, asan, yüngül) mənasını daşıdığını qeyd etmişdir. Cümlə səhvini nəzərə alaraq onu bir daha tərcümə etməyə səy göstərdik: "**Hər bir iş Ona asandır**". (R.H.)*

[23] *Türk mətnində: "**Allahu Teala, yarattıklarını onlar öldükten sonra da, onları yoktan ilk kez nasıl yaratmışsa, öyle diriltecektir**" – kimi təqdim olunan bu cümlə, əsərin orijinalına uyğun deyil. Ərəb dilində:*

yaratdıqlarını varlığa gətirdikdən sonra Yaradıcı olduğu kimi, onları varlığa gətirməmişdən əvvəl də Yaradıcı idi.[24]

---

كما أنه محيي الموتى بعد أن يحييهم ، فإنه محيي الموتى قبل أن يحييهم

*- deyə ifadə olunan bu cümlənin əsli nüsxəyə müvafiq tərcüməsi belədir:* ***"O, ölüləri diriltdikdən sonra Dirildən olduğu kimi, onları diriltməzdən əvvəl də Dirildən idi...".*** *(R.H.)*

[24] *Kitabın əlimizdə olan ərəb orijinalına (1414-cü il, ər-Riyad şəhəri, «Dərul-vətən» mətbəəsi, 1-ci nəşr) baxdıqda, şərhçi prof. M. Xumeyyisin aşağıdakı sözlərinin türk tərcüməsində olmadığı aşkar edildi:*

لأنه – سبحانه وتعالى – على كل شيء قدير، إذا أراد شيئا فعله، وإذا لم يرد شيئا لم يكن هذا الشيء، وهذه هي الإرادة الكونية القدرية التي لا يخرج عنها شيء، ولا تتخلف أبدًا، وقد قالت المعتزلة : قادر على كل ما هو مقدور له ، وأما أفعال العباد فلا يقدر عليها، وهذا سلب لصفة الكمال فإن الله – تعالى – قادر على كل شيء كما أخبره عن نفسه – سبحانه وتعالى - ﴿ والله على كل شيء قدير﴾ (سورة البقرة ، الآية 284) وكذلك كل شيء كائن في هذا العالم فبإرادة الله – تعالى – ومشيئته والإيمان بهذه المسألة من أهم لوازم الإيمان بالربوبية لله – تعالى -، وكل شيء في هذا الكون مفتقر إلى الله – تعالى – محتاج إليه في إيجاده وبقائه، وكل أمر على الله – تعالى -: يسير كما قال – تعالى -: ﴿ إن ذلك على الله يسير ﴾ (سورة الحديد، الآية: 22)، وهو لا يحتاج إلى شيء – سبحانه وتعالى – بل كل شيء محتاج إليه ضرورة وحاجته لله – تعالى – ثابتة لا تتغير ولا تكون في وقت دون وقت أو مكان دون مكان. ﴿ ليس كمثله شيء وهو السميع البصير﴾ (سورة الشورى ، الآية: 11).

***"...Çünki pak və nöqsansız olan uca Allah hər bir şeyə qadirdir. O bir işi etmək istəyərsə, onu edər. Əgər bir işin də olmasını istəməzsə, o olmaz. Bu, Allahın, qədəri ilə bütün olacağı əhatə edən istəyidir. Heç bir şey ondan kənarda və arxada qala bilməz. Mötəzileçilər demişlər: Allah, qədəri yazılmış hər bir şeyə gücü çatandır. Bəndələrin əməllərinə gəlincə, Onun buna gücü çatmayır. Bu (kəlimə, Allahın) kamillik sifətinə xələl gətirir. Çünki uca Allah hər şeyə qadirdir. Pak və nöqsansız Allah Özü haqda xəbər verərək buyurur: ﴿ O, hər şeyə qadirdir! ﴾ (əl-Bəqərə, 2/284). Eləcə də kainatda olan hər bir şey uca Allahın iradəsi və istəyi ilə var olmuşdur. Məsələyə iman gətirmək uca Allahın rübubiyyətinə imanın ən mühüm əsaslarındandır. Kainatdakı hər bir varlıq öz valığında və mövcudluğunda uca Allaha möhtacdır. Hər bir iş uca Allaha asandır. O buyurur: ﴿ Bu, Allah üçün çox asandır! ﴾ (əl-Hədid, 57/22). Onun heç bir şeyə ehtiyacı yoxdur. O pak və ucadır. Əksinə hər bir şey zəruri olaraq Ona möhtacdır. Varlıqların uca Allaha olan ehtiyacı dəyişməz və sabit qalaraq müəyyən bir zaman və ya məkan anlamı ilə***

## Xülasə

**ALLAH**ın zatı və əməli sifətləri qədim və əzəlidir.[25] **ALLAH** təala məxluqatı yaratmamışdan qabaq da, yaratdıqdan sonra da bu sifətlərə layiqdir.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. **ALLAH** təalanın Rububiyyət sifətinə malik olması üçün mərbublara ehtiyacı varmı?

2. **ALLAH**ın qüdrəti hər şeyə qadirmidir?

3. «Onun bənzəri olan heç bir şey yoxdur» sözünün mənası nədir?[26]

# DÖRDÜNCÜ DƏRS

**18. ALLAH yaratdıqlarını elmi ilə xəlq etmişdir.**

**19. Yaratdıqlarına alın yazısı təyin etmişdir.**

**20. Onların hər birinə əcəl *(zaman, müddət)* də müəyyən etmişdir.**

**21. Onları yaratmamışdan qabaq da Onun üçün heç nə gizli deyildi. Yaratmamışdan əvvəl onların nə edəcəklərini də bilirdi.**

---

***məhdudlaşmır. O buyurur: ﴿ Ona bənzər heç bir şey yoxdur ﴾ (əş-Şura, 42/11)"*** *(R.H.)*

[25] *Əsərin ərəb orijinalına baxdıqda aşağıdakı cümlənin türk tərcüməsində olmadığı aşkar edildi:*

... وإن حدثت آحادها و هي باقية ببقائه – تعالى –

***"(Bu sifətlərdən – red.) bəzilərinin (müəyyən bir hadisə ilə əlaqədar –red.) meydana gəlməsinə baxmayaraq, onlar uca Allahın əbədiliyi ilə bəqidirlər".*** *(R.H.)*

[26] *Bu cümlə ərəb orijinalında aşağıdakı kimidir:*

(3) ما معنى قوله – تعالى – ﴿ ليس كمثله شيء ﴾؟

***"Uca Allahın: ﴿ Ona bənzər heç bir şey yoxdur ﴾ (əş-Şura, 42/11) – buyruğunun mənası nədir?"*** *Tərcümələri müqayisə et. (R.H.)*

## ŞƏRH

Uca **ALLAH** yaratdıqlarını onlar barəsində bilərək yaratmışdır. Belə ki:

 ***Məgər yaradan*** [*sizin gizli saxladığınız hər şeyi*] ***bilməzmi?! ALLAH*** [*hər şeyi*] ***incəliyinə qədər biləndir,*** [*hər şeydən*] ***xəbərdardır!  (əl-Mulk, 14)***

 [*Rəbbin*] ***onların keçmişini də, gələcəyini də bilir. Onların elmi isə Onu*** [*Allahın zatını*] ***əhatə edib qavraya bilməz  (Taha, 110).***[27]

 ***Nə göylərdə, nə də yerdə zərrə qədər bir şey Ondan gizli qalmaz. Bundan kiçik, yaxud böyük elə bir şey də yoxdur ki, açıq-aydın Kitabda*** [*Lövhi-məhfuzda*] ***olmasın!  (Səba, 3).***

Heç nə Ondan gizli qala bilməz, heç nə Onun elmindən kənara çıxa bilməz. Onun elmi külli və cüzi miqdarda olan hər şeyi əhatə edir.[28] Belə ki, əziz və uca **ALLAH** belə buyurur:

 ***Şübhəsiz ki, Biz hər şeyi müəyyən ölçüdə*** [*lazım olduğu qədər*] ***yaratdıq  (əl-Qəmər, 49).***

 ***O, hər şeyi yaratmış və onu*** [*onun nə cür olacağını*] ***əvvəlcədən müəyyən etmişdir  (əl-Furqan, 2).***

Xeyir və şərin hər ikisi təqdir edilməklədir. Hər şey müəyyən qədər (ölçü, hədd və vaxt çərçivəsində) yaradılmışdır. Hər yaradılan şeyin təyin edilmiş hüdudları (parametrləri) vardır.[29]

---

[27] *Prof. M. Xumeyyisin, Mülk surəsindən sonra verilmiş:*

فعلمه – تعالى – محيط بكل شيء ، كما قال – تعالى –:

***"Allah təalənin elmi hər şeyi əhatə edib. Uca olan belə buyurur: "***

*Taha surəsindən sonra isə:*

يعلم ما كان وما يكون، وما لم يكن لو كان كيف يكن:

***"O, keçmişi, gələcəyi və olmayanları, hətta baş versələr belə necə olacaqlarını bilir."*** *- sözləri türk tərcüməsində buraxılmışdır. (R.H.)*

[28] *Türk tərcüməsində, ərəb orijinalındakı aşağıdakı cümlə buraxılmışdır:*

وكل شيء خلقه الله – تعالى – بقدر

***"Uca Allah hər şeyi qədərlə yaratmışdır"*** *(R.H.)*

[29] *Özündən əvvəlki cümlə ilə eyni məna daşıyan bu ifadəni əsərin ərəb orijinalı ilə müqayisə etdikdə onların bir cümlədən ibarət olduğunu və türk*

Bu, «şərin» **ALLAH** tərəfindən yaradılmadığını iddia edənlərə cavabdır. **ALLAH,** yaratdıqlarını, aşa bilməyəcəkləri bir zaman və məkan hədləri ilə xəlq etmişdir:

*** Onların əcəli gəlib çatdıqda bircə saat belə nə yubanar, nə də tələsərlər! (əl-Ə'raf, 34).***

**ALLAH**ın təyin etdiyi əcəli qabaqlayan və yaxud geriyə qoyan heç bir şey yoxdur.

Bəli, **ALLAH** təala kainatı yaratmamışdan əvvəl olduğu kimi, indi də hər şeyi bilir. O, iman sahibləri, şirk və küfr əhli, salehlər və talehlər (saleh olmayanlar) haqqında kainatı yaratmazdan qabaq da bilirdi. Hansı gündə, vaxt və yerdə onların başına nə gələcəyini də bilir. Xəlq etdiklərinə dair olan heç bir şey Ondan gizli qalmaz.

## Xülasə

**ALLAH** xəlq etdiklərini məlum bir meyarla alim kimi* yaratmışdır. Yaratdıqlarının əməllərinin heç bir təfərrüatı Ondan gizli qalmır. O, yaratmazdan əvvəl də xəlq edəcəklərinin hansı əməlləri törədəcəklərini bilir.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. «Yaratdıqlarına müəyyən bir əcəl təyin etmişdir» sözü hansı mənanı verir?

2. **ALLAH** təala mükəlləf olanların (insan və cinlərin) əməllərini, onları yaratmamışdan əvvəl də bilirmidi?

---

*tərcüməsində səhvən təkrar yazıldığını aşkar etdik. Onların ərəb və türk dilidəki ifadəsi aşağıdakı kimidir:*

فالخير والشر مقدران ، وكل شيء مخلوق بقدر، وفي ذلك رد على من زعموا أن الشر ليس مخلوقا لله .

***"Hayır ve şerrin her ikisi de takdirledir. Herşey bir kader (ölçü, sınır ve zaman) ile yaratılmıştır. Her yaratılan şeyin bir kaderi vardır. Bu, «şerr»in Allah tarafından yaratılmadığını iddia edenlere bir cevaptır".*** *(R.H.)*

* *Özünün elminə əsaslanaraq (F.S.)*

# BEŞİNCİ DƏRS

**22. Bəndələrinə Ona itaət göstərmələrini hökm edərək, buna etiraz etmələrinə qadağa qoymuş.**

**23. Hər şey Onun təqdiri və istəyi ilə baş verir. Onun istəyi olmadan bəndələrinin istəyi mümkün deyil. Onun onlar üçün istədiyi mümkün olar, istəmədiyi olmaz.**

## ŞƏRH

**ALLAH** bəndələrinin Ona itaət etməsini hökm etmişdir. Ona itaət edilməsinə görə onlara kifayət qədər əvəzini verəcəyini vəd etmişdir. Ona qarşı çıxmalarını qadağan edərək, bundan ötrü onları cəzalandıracağını bildirmişdir. **ALLAH** təala belə buyurmuşdur:

 ***Hər kəs ALLAHa və peyğəmbərinə itaət edərsə, ALLAH onu ağacları altından çaylar axan cənnətlərə əbədi olaraq daxil edər ki, bu da [****möminlər üçün****] böyük uğur və qurtuluşdur! Hər kəs ALLAHa və Peyğəmbərinə itaət etməyib Onun sərhədlərini aşarsa, ALLAH da onu həmişəlik Cəhənnəmə daxil edər. Onu rüsvayedici əzab gözləyir  (ən-Nisa, 13-14).***

Əmr etmək və yaratmaq təkcə **ALLAH**ın haqqıdır:[30]

 ***Bilin ki, yaratmaq da, əmr etmək də Ona məxsusdur  (əl-Ə'raf, 54).***

---

[30] *Türk mətninə (yəni,* ***«Emir ve yaratma sadece Allahın hakkıdır»*** *ifadəsinə) uyğun çevrilmiş bu cümləni, əsərin əsli nüsxəsi ilə müqayisə etdikdə onun müxtəsər tərcümə edildiyi aşkar oldu. Kitabın orijinallığını qorumaq məqsədilə onu bir daha tərcümə etməyə səy göstərdik:*

وذكره رحمه الله – تعالى – للأمر والنهي بعد كلامه عن الخلق إشارة إلى أن الخالق له الأمر والنهي كما قال – تعالى –

***«İmam Təhavi (Uca Allah ona rəhmət etsin) yaradılış barəsində danışdıqdan sonra əmr etmək və qadağa qoymaq ayəsini xatırlatmışdır ki, bununla da əmr vermənin və qadağa qoymanın Yaradana məxsus olduğuna işarə etmişdir».*** *(R.H.)*

Hər şey **ALLAH**ın təqdiri, istəməsi, qəza və qədəri ilə cərəyan edir. Yer üzündə **ALLAH**ın istəyi olmadan heç nə mümkün ola bilməz.[31] Bu kainatda **ALLAH** istəməsə heç bir şey gerçəkləşə bilməz. Təkcə Onun istədiyi olur və həyata keçir. Onun istədiyi qəti olur. Olmaması mümkün deyil. Buna, Allahın bütün olacağı əhatə edən iradəsi və «qədər»[32] deyilir. Bununla ifadə edilmək istənilən şey, *bu kainatda xeyir və şər, mövcud olan hər şey Ondandır* mənasındadır.

□ ***ALLAH istədiyini [****haqq yoldan****] azdırar, istədiyini isə düz yola yönəldər*** □ ***(əl-Ən'am, 39).***

□ ***Əgər ALLAH istəsəydi, bu peyğəmbərlərin ardınca gələn insanlar onlara göndərilən aşkar dəlillərdən sonra bir-biriləri ilə vuruşmazdılar. Fəqət [****bununla belə yenə də****] ixtilafa düşdülər.*** □ ***(əl-Bəqərə, 253).***

Bəndələrinin iradə və istəkləri **ALLAH**ın istəyi olmadan gerçəkləşə bilməz.

□ ***[****Onu da bilin ki,****] aləmlərin Rəbbi olan ALLAH istəməsə, siz [****bunu****] istəyə bilməzsiniz!*** □ ***(ət-Təkvir, 29).***

Bütün olacağı əhatə edən bu iradə, bəzən gerçəkləşməyən şəriət iradəsindən fərqli bir iradədir. **ALLAH** bir şeyi sevdiyi halda onun olmasını istəməyə bilər. **ALLAH** bir şeyi istəmədiyi halda belə Onun hikməti və elmi üçün zəruri olduğuna görə, onun olmasını diləyə bilər.[33]

---

[31] *Türk nüsxəsində:* ***«Yeryüzünde Allahın istegi olmadan hiçbir şey olmaz»*** *- kimi verilmiş bu cümlədə, «yeryüzünde» sözü ərəb mətninə:*

فليس هناك شيء كائن إلا بمشيئة الله تعالى

*- əlavədir. (R.H.)*

[32] ***«Qədər»*** *- (ər.* قدر*) tale, alın yazısı, qismət (F.S.)*

[33] *Türk mətninə (yəni,* ***«ALLAH bir şeyi sevmədigi halde, Onun hikmeti və ilminin qeregi olarak olmasını dileyebilir»*** *ifadəsinə) uyğun çevrilmiş bu cümləni əsərin ərəb orijinalı ilə:*

وقد يبغض الله أمرًا لكنه يشاء أن يقع لحكمة يعلمها

*- müqayisə etdikdən sonra,* ***«Onun hikməti və elmi üçün...»*** *sözlərinin tərcüməsini,* ***«Onun bildiyi bir hikmət üçün...»*** *kimi daha düzgün hesab etdik. (R.H.)*

**ALLAH** bəndələri üçün nəyi istəyərsə, o da olar. Nəyi isə istəməzsə, hətta insanların hamısı bunun olmasını arzulasalar da belə bu mümkün olmaz. Qədəriyyə[34] tərəfdarları isə belə düşünmürlər. Onlara görə insanlar özləri öz günahlarını yaradır və onu işlədirlər. İnsanın iradəsi **ALLAH**ın iradəsindən asılı deyil. **ALLAH** pisliyi istəməz. O pisliyi edən ancaq insandır. Çünki **ALLAH** onu diləməz. Məhz bu tərzdə Qədəriyyəyə mənsub olanlar insanların **ALLAH**dan asılı olmayaraq hər hansı bir şeyi arzu edə biləcəklərini və **ALLAH**ın iradəsi olmadan onu gerçəkləşdirə biləcəklərini mümkün hesab edirlər. Amma bu nəzər nöqtəsi doğru deyildir.

**24. O Öz mərhəmətindən istədiyinə hidayət nəsib edər, istədiyini qoruyar, onu əhv edər və bağışlar. Ədalətinin təcəssümü olaraq istədiyini azdırar, köməksiz qoyar və bəlalara düçar edər.**

## ŞƏRH

**ALLAH** istədiyi qullarını imana yetişdirər. İstədiyini zəlalətlərdən və günahlardan qoruyar və onları bu dünyada və axirətdə pis əməllərdən uzaqlaşdırar. Allah Öz lütfkarlığına görə insanlara belə münasibət bəsləyir. Bu, Ona məxsus nemətdir və buna şükr etmək lazımdır.

Bu qaydayla **ALLAH** bəndələrindən hansı birini istərsə azdırar, onlara yardım etməz və onları nəfisləri ilə imtahana çəkər. Bəndələri ilə şeytanın arasına sədd çəkməz. Onları Özü qorumamaqla imtahana çəkər. Beləliklə, onlar özlərini itirərək günaha batarlar. Bu, **ALLAH**ın ədalətinə zidd deyildir. Bunda

---

[34] ***«Qədəriyyə»*** *- Qədəri inkar edən bir dini məhzəbdir. Qədəriyyəyə görə «insan bütün etdiklərinin yaradıcısıdır». Qullara aid bu əməllərin **ALLAH**ın istəyi ilə deyil, qulun icadı ilə meydana gəldiyini iddia edir. Bu dini cərəyanın tərəfdarları, olmuş və olacaq bütün hadisələrin, əzəli olan ilahi elmdə yazılmış olduğunu (Qədəri, Talei) qəbul etmirlər. (M.E. Akın)*

Onun sonsuz hikməti vardır. O, mütləq ədalət sahibidir. İstədiyini hidayətə çatdırar, istəmədiyini isə çaşdırar[35].

**ALLAH** təala Kitabında belə buyurur:

** *ALLAH istədiyini [haqq yoldan] azdırar, istədiyini isə düz yola yönəldər*  *(əl-Ən‘am, 39).***

** *ALLAH dilədiyini yoldan çıxardar, dilədiyini isə doğru yola salar*  *(ən-Nəhl, 93).***

** *[Ya Məhəmməd!] Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma ALLAH dilədiyini doğru yola salar* *(əl-Qəsəs, 56).***

Bunların hamısı **ALLAH** dərgahındandır. Bu, mötəzilə[36] tərəfdarlarının müdafiə etdiyinin əksinə olaraq əhli-Sünnə vəl-

---

[35] ***ALLAH*** *təalanın istədiyi kəsi çaşdırması, insana verilən cüzi iradəsini onun azğınlıq yolunda tətbiq etməsilə bağlıdır.* ***ALLAH*** *xeyri və şəri, yaxşılığı və pisliyi açıq şəkildə bəyan etmişdir. Hər ikisinin nəticələrini də bildirmişdir. Bəndə isə buna baxmayaraq iradəsini şər işlərə sərf etdikdə* ***ALLAH*** *təala onu yolundan azdırır. Əksinə, insan öz bacarığını zəlalətə və asiliklərə yönəltmədikcə, ilahi iradə onu zəlalət yoluna məcburi surətdə sövq etməz. Bu məsələdə, məcburiyyətdən bəhs edilmir. Sənə üz verən hər bir pislik isə özündəndir (ən-Nisa, 79). (M.E.Akın)*

[36] ***Mötəzilə -*** *Bu ad Vasil b. Ataya tabe olanlara verilən addır. Onlara «mötəziləçilər» deyilməsinin səbəbi onların Həsəni-Bəsridən (r.a.) ayrılmalarındandır, yəni,* ***etizal*** *(اعتزال) etmələrindəndir. Onlar hicri tarixinin ikinci əsrinin başlanğıcında Həsəni-Bəsri ilə böyük günah işlədənin vəziyyətiylə bağlı ixtilaf edərək ayrıldılar. Mötəzililər öz məzhəblərini beş əsas üzərində qururlar: 1) əl-Ədl – bu məsələdə onların ədalətdən umduqları qədərin inkar edilməsidir; 2) Tövhid – bununla onlar Allahın sifətlərini rədd etməyi qarşılarına məqsəd qoyurlar; 3) İnfazul-vaid – bəndələrə yaxşı və xoş olan şeyləri yaradıb verməsini Allah üçün vacib sayırlar. Bəndələrdən itaət edənə savab, etiraz edənə isə cəza verməsi də Allaha vacibdir. 4) Mənzilə beynəl-mənziləteyn – bundan isə məqsədləri aşağıdakılardır: böyük günah işlədənlər imanla küfr arasında bir mənzildə olurlar. Əgər tövbə etmədən ölsələr, əbədi olaraq cəhənnəmlik olarlar.; 5) Əmri-bil-məruf vən-nəhyi anil-münkər – bundan məqsədləri aşağıdakılardır: başqalarına öz fikirlərini qılınc gücüylə qəbul etdirmək. Bu məsələdə onlar imamlara qarşı üsyana qalxmağa qədər irəli getmişlər (İmam Bağdadi, Fərq beynəl-firaq, sh. 144;*

Camaat əqidəsinin əsaslarındandır. Mötəzilə tərəfdarları bəndələrin əməllərinin özləri tərəfindən yaradıldığına inanırlar. Lakin aydın olmalıdır ki, kim hidayətə çatmışsa, onu hidayətə Öz lütfkarlığı ilə **ALLAH** çatdırmışdır. Kim yolundan azmışsa, onu ədalətiylə azdıran **ALLAH**dır.

**25. Hamı Onun lütfkarlığı və ədaləti ilə diləməsi çərçivəsində bu dünyaya gələr və gedər.**

## ŞƏRH

İnsan möminsə, hidayətə çatmış rəşid[37] bir insandır ki, bu da **ALLAH**ın lütfkarlığı, Onun elmi, hikmət və neməti ilə baş verir.[38] Əgər o, küfr və ya günah əməllərə qurşanmışdırsa, bu da **ALLAH**ın ədaləti, Onun elmi, hikməti ilə belə olmuşdur. **ALLAH**ın istəyindən kənarda kimsə yoxdur:

 *[Onu da bilin ki,]* ***aləmlərin Rəbbi olan ALLAH istəməsə, siz*** *[bunu]* ***istəyə bilməzsiniz  (ət-Təkvir, 29).***

Sonra, bir bəndə kimi, zamana da hidayət edilməsinə baxmayaraq, **ALLAH** onu işlətdiyi günahlarına və ya qəflətdə olmasına görə cəzalandırdıqdan sonra, hidayətini ona uğrada bilər. Bəndə kimi, zaman da açıq-aydın zəlalətə düşə bilər. Bunların hamısı **ALLAH**ın istəyi ilədir. [39]

---

*İmam Əşari, Məqalətul-islamiyyin, c. 1, sh. 235; İbn Əbil-İz, Şərhi Təhavi, sh. 524) (M. Akın).*

[37] ***Rəşid*** (رشيد) *– ağıl-kamal həddinə çatmış, düzgün, sağlam, doğru insan mənasında işlədilir (Ərəb və fars sözləri lüğəti, Bakı, Yazıçı, 1983) (F.S.)*

[38] *Əsərin ərəb orijinalına baxdıqda pr. M.A. Xumeyyisin şərhinin türk mətninə uyğun çevrilmiş bu sözlərlə başlamadığı və onlardan əvvəlki cümlənin buraxıldığı aşkar olundu. Onun tərcüməsi belədir:*

وكل الناس يتقلبون في مشيئة الله – تعالى – بين هذين الأمرين ، الفضل والعدل

***«Bütün insanlar lütfkarlıq və ədalət kimi bir məsələyə bağlı olaraq uca ALLAHın istəyinə uyğun bu dünyaya gələr və gedərlər»****. (R.H.)*

[39] *Türk mətninə uyğun çevrilmiş bu abzas, həmin nüsxədə aşağıdakı kimi verilmişdir:* ***«Sonra, bir kulun kimi zaman hidayet üzere olmasını rağmen, Allah onu işledigi qünalardan veya qafletten dolayı cezalandırdıktan sonra***

***kendisine bu hidayet ulaşmış olabilir. Kul kimi zaman da apaçık dalalette ola bilir. Bunların hepsi, Allahın dilemesiyledir».***

*Onu əsərin ərəb orijinalı ilə:*

ثم إن المرء نفسه قد يهتدي تارة بفضل الله – تعالى، ثم يعاقبه الله – عز وجل – على ذنوب أو غفلة فيخذله، ثم قد تدركه الهداية بعد ذلك، وقد يضل ضلالاً أبديًّا والعياذ بالله – تعالى – وكل شيء بمشيئته – عز وجل – .

*- müqayisə etdikdən sonra üzərində bəzi dəyişikliklərin aparılmasını məqsədəuyğun hesab etdik. Buna səbəb, «****ALLAHın lütfü ilə»*** *və* ***«Sığınacaq uca Allahadır»*** *sözlərinin mətndən tamamilə götürülməsi,* ***«əbədiyyən»*** *kəliməsinin isə,* ***«apaçık»***, ***«açıq-aşkar»*** *kimi çevrilməsi və sairə olmuşdu. Onun tam və düzgün hesab etdiyimiz tərcüməsi aşağıdakı kimidir: «****Bəzən də bir bəndə kimi uca ALLAHın lütfü ilə hidayət edildikdən sonra, əziz və cəlil ALLAH onu işlətdiyi günahlara və ya qəflətdə olmasına görə cəzalandırır. Bundan sonra o ya hidayətə uğrayır, ya da əbədi bir zəlalətə düçar olur. Sığınacaq uca Allahadır. Hər bir şey izzət və cəlal sahibi olan ALLAHın istəyilədir»***. *(R.H.)*

## Xülasə

Uca **ALLAH** xəlq etdiklərinə Ona itaət etməyi əmr etmiş, günahlara isə qadağan qoymuşdur. Hər şey Onun iradə və istəyi ilə baş verir. Bəndələrin istəyi **ALLAH**ın bəyənməsini aşa bilməz. O, istəsə ya hidayətə çatdırar, ya da zəlalətə düçar edər. Heç kim Onun iradəsindən kənara çıxa bilməz.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Uca **ALLAH** nəyi əmr etmiş və nəyi yasaqlamışdır?
2. **ALLAH** xeyri istədiyi kimi, şəri də istəyirmi?
3. «**ALLAH** istədiyini ədalətiylə zəlalətə salır» ifadəsini açıqlayın.



# ALTINCI DƏRS

**26. O, Ona (qarşı) zidd olanlardan və bərabər tutulanlardan çox ucadır.**

**27. Onun verdiyi əmrin həyata keçməsinə və hökmünə mane ola biləcək kimsə yoxdur. Onun əmrini üstələyə bilən də yoxdur.**

## ŞƏRH

Uca **ALLAH**ın əmrində, hökmündə, yaradıcılığında və səltənətində Ona qarşı dura bilən bir əks qüvvə, adlarında və sifətlərində də Ona bənzəri və Ona bərabəri yoxdur.[40]

***Ona bənzər heç bir şey yoxdur*** ***(əş-Şura, 11).***

***İndi siz də ALLAHın oxşarı və bənzəri olmadığını bildiyiniz halda, Ona şəriklər qoşmayın!*** ***(əl-Bəqərə, 22).***

Uca **ALLAH** vücuda gətirdiyi bir şeyi istəyib yaratdıqda, bütün insanlar belə yığışıb onun əlində olan faydanı almaq istəsələr və ya vurmaq istədiyi bir zərərin qarşısını almaq

---

[40] *Bu abzas türk mətninə uyğun çevrilmişdir:* ***«Allahu Tealanın emrinde, hükmünde, yaratmasında ve mülkünde Ona karşı koyabilecek bir karşıtı, isimlerinde ve sıfatlarında da Ona benzer ve denk olacak birisi yoktur».*** *Onu ərəb orijinalı ilə:*

إن الله –تعالى – متعالٍ ومتنزه عن أن يكون له ضد مخالف في أمره وحكمه وخلقه وملكه ، أو ند مماثل مكافئ في شيء من ذلك ، أو في أسمائه وصفاته ، بل إنه – سبحانه وتعالى –: ليس كمثله شيء

*- müqayisə etdikdə, əsli nüsxədən bəzi sözlərin ixtisar olunduğu aşkar edildi. Onun orijinala uyğun tərcüməsi aşağıdakı kimidir:* ***«Uca ALLAH, əmrində, hökmündə, yaradıcılığında və səltənətində Ona (qarşı) zidd olan birinin ola bilməsindən, yaxud da bu deyilənlərdə və eləcə də ad və sifətlərində bənzəri və oxşarı olan bir ortaqının olmasından çox yüksək və uzaqdır. Çünki O, (nöqsan və eyblərdən) pak və ucadır. Ona bənzər heç bir şey yoxdur (əş-Şura, 11)».*** *(R.H.)*



istəsələr, buna qətiyyən gücləri çatmaz. Beləliklə, əziz və cəlil olan Uca **ALLAH** Kitabında belə buyurur:

 ***ALLAHın insanlara əta etdiyi mərhəmətə [****verdiyi nemətə, ruziyə****] heç kəs mane ola bilməz. Onun vermədiyi bir şeyi də Özündən başqa heç kəs göndərə bilməz. O, yenilməz qüvvət və hikmət sahibidir!  (Fatir, 2).***

 ***Bir şeyi [****yaratmaq****] istədiyi zaman ALLAHın buyuruğu ona ancaq: «Ol!» – deməkdir. O da dərhal olar  (Yasin, 82).***

**ALLAH** bir hökm verdikdə Onun hökmü mütləq yerinə yetir və davam edir:[41]

 ***Hökm edən ALLAHdır. Heç kəs Onun hökmünü dəf edə bilməz  (ər-Rəd, 41).***

 ***Əgər ALLAH sənə bir sıxıntı versə, [****səni ondan****] ALLAHdan başqa heç kəs qurtara bilməz. Əgər ALLAH sənə bir xeyir yetirsə, [****heç kəs Ona mane ola bilməz****]. Çünki O, hər şeyə qadirdir!  (əl-Ənam, 17).***

---

[41] *Türk mətninə (yəni,* ***«Allah bir hüküm verdiginde Onun hükmü mutlaka olur ve devam eder»*** *ifadəsinə) uyğun çevrilmiş bu cümləni əsərin əsli nüsxəsi ilə:*

وإذا حكم الله تعالى بأمرٍ فإن حكمه نافذ ماضٍ لا يؤخره شيء .

*- müqayisə etdikdə,* ***«və onu*** *(yəni, Allahın hökmünü)* ***təxirə salacaq bir şey yoxdur»*** *(لا يؤخره شيء) ifadəsinin səhvən,* ***«və davam edir»*** *(türkcə* ***«davam eder»****) kimi tərcümə olunduğu aşkar edildi. (R.H.)*

## Xülasə

Uca **ALLAH** əleyhdarı, bərabəri və bənzəri olmaqdan uzaqdır. Bir şeyin olmasını istədikdə, heç kim onu ləngidə bilməz və Onun əmrinə kimsə qalib gələ bilməz.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. **ALLAH**ın əleyhdarı (əleyhinə gedəni) və bərabəri olmaması nə deməkdir?

2. **ALLAH**ın hökmünü və qəzasını təxirə sala bilən varmıdır?[42]



[42] *Bu cümlə, türk mətninə (yəni,* ***«Allahın hükmünü ve kazasını tehir edebilecek olan varmıdır?»****) uyğun şəkildə Azərbaycan dilinə çevrilmişdir. Onu ərəb orijinalı ilə:*

هل يؤخر قضاء الله وحكمه شيء؟

*- müqayisə etdikdə,* ***hökm və qəza*** *sözlərinin bir-birilə dəyişik salındığı aşkar oldu. Beləki ərəb nüsxəsində ilkin olaraq* ***qəza****, sonra isə* ***hökm*** *sözü yazılmışdır. (R.H.)*

# YEDDİNCİ DƏRS

**28. Bunların hamısına beləcə iman gətirdik və hamısının Onun dərgahından olduğuna qəti olaraq inandıq.**

**29. Və həqiqətən Məhəmməd (s.ə.s.) Onun seçilmiş qulu və peyğəmbəridir. Ondan razı qalınmış Elçisidir.**

## ŞƏRH[43]

Məhəmməd (s.ə.s.) Onun ən məşhur və gözəl adlarındandır. Bu isə Onun çox gözəl əxlağının ifadəsidir.

O, Abdullah oğlu Abdulmütəllib b. Haşim oğlu Məhəmməddir. Qurreyşin ən mötədil və seçilmiş hissəsindən olan bir qəbilədəndir.[44]

Bəndəlik insan üçün pillələrin ən şərəflisidir.

***...bəndəsini bir gecə Məscidülhəramdan ətrafını mübarək etdiyimiz Məscidüləqsaya aparan ALLAH pak və müqəddəsdir*** ***(əl-İsra, 1).***

---

[43] *Türk mətnində 28-ci bəndin şərhi ixtisar edilmişdir. Onun tərcüməsi aşağıdakı kimidir:*

آمنا وصدقنا بكل ما سبق وتحققنا منه ووقر في نفوسنا يقينًا جازمًا .

***«Biz irəlidə deyilənlərin hamısına iman gətirdik və təsdiqlədik. Onların gerçəkliyində qətiləşdikdən sonra qəlblərimizə tam bir yəqinlik çökdü».*** *(R.H.)*

[44] *Türk mətninə (yəni,* ***«O, Abdullahoğlu, Abdulmuttalib b. Haşimoğlu Muhammeddir. Kureyşin soy olarak en mutedil ve seçkin kesimindendir»*** *cümləsinə) müvafiq çevrilmiş bu ifadəni əsərin əsli nüsxəsi ilə:*

وهو محمد بن عبدالله بن عبدالمطلب بن هاشم ، من قريش ومن أوسط العرب نسبًا ، ومن أنفسها حسبًا ، وأعرقها ممتدًا .

*müqayisə etdikdə bir sıra uyğunsuzluqlarla rastlaşdıq. Onun düzgün hesab etdiyimiz tərcüməsi aşağıdakı kimidir:* ***«O, Haşim b. Abdulmuttalib b. Abdullah oğlu Məhəmməddir. Qureyş qəbiləsindəndir. Ərəblərin ən mötədil, seçilmiş və qədim bir tayfasından idi».*** *(R.H.)*

*** Əgər bəndəmizə [*Məhəmmədə*] nazil etdiyimizə [*Qurana*] şəkkiniz varsa...  (əl-Bəqərə, 23).***

*** ALLAHın bəndəsi [*Məhəmməd əleyhissəlam*] qalxıb Ona ibadət edəndə [*cinlər Quranı dinləmək üçün toplaşmış izdihamın çoxluğundan*] az qala bir-birinin üstünə minələr  (əl-Cinn, 19).***

Uca **ALLAH** bəndələrinin ən seçilmişlərinin arasından Onun üstünlüyünü nəzərə alıb Öz istəyi ilə Onu nəbi kimi seçib göndərmişdir. O, seçilmiş, təriflənmiş və **ALLAH**ın sevdiyi, Ona yaxın olan bir nəbidir. O, **ALLAH**ın Öz risaləti üçün seçdiyi son elçisidir. Ona kitablarının ən ucasını və ən əzəmətlisini vermişdir.

**30. O, peyğəmbərlərin sonuncusu, müttəqilərin[45] öndəri, rəsulların ağası və aləmlərin Rəbbinin sevimlisidir.**

**31. Ondan sonra peyğəmbərlik iddialarının hamısı həddən ziyadə yolundan azmaq, əsassız bir şeyə uymaqdır.**

## ŞƏRH

Məhəmməd (s.ə.s.) peyğəmbərlərin sonuncusudur. Uca **ALLAH** Kitabında belə buyurur:

*** Məhəmməd aranızdakı kişilərdən heç birinin atası deyildir. Lakin o, ALLAHın Rəsulu və peyğəmbərlərin sonuncusudur  (əl-Əhzab, 40).*** O, insanlar arasında **ALLAH**dan ən çox qorxan və ən gözəl ölçüdə təqvalı olandır. Özü belə deyərdi[46]:

---

[45] ***Müttəqi*** *(ə. متقى) –* ***ALLAH****dan qorxan, dindar, mömin (ƏFS lüğəti, Bakı, 1985) (F.S.)*

[46] *Bu hədis, əsərin ərəb orijinalına uyğun tərcümə edilmişdir. Onu sətiraltı qeyddə göstərilən mənbə ilə (yəni, «Buxari, Kitabun-Nikah, Babut-Tərğibi fin-Nikah, 9/104, (5063)) müqayisə etdikdə, onlar arasında fərq aşkar edildi. Beləki imam Buxarinin «Səhih»indəki hədis:*

((... إني لأخشاكم لله وأتقاكم له ...))

*«Sizin ALLAHdan ən çox qorxanınız və təqvalınız Mənəm»,*

*- prof. M. Xumeyyisin təqdim etdiyi rəvayət isə:*

(( إني لأخشاكم لله وأعلمكم بحدود الله ))

*«Sizin ALLAHdan ən çox qorxanınız və Onun sərhədlərini ən yaxşı biləniniz Mənəm»* [47].

*«Sizin ən təqvalınız və ALLAHın sərhədlərini ən yaxşı biləniniz Mənəm»* [48 - 49]

*«Bu tərif deyil, Mən Adəm övladlarının ağasıyam».* [50 - 51]

---

*- «Sizin ALLAHdan ən çox qorxanınız və Onun sərhədlərini ən yaxşı biləniniz Mənəm» - mətni ilə verilmişdir. Qeyd edim ki,* ***«Təhavi əqidəsinin asanlaşdırılmış şərhi»*** *əsərində göstərilən mətni bir sıra tanınmış hədis kitablarında axtardıqdan sonra yalnız mənaca ona yaxın olan bəzi rəvayətləri (məsələn, Beyhəqinin «Sünən» (7/77, h.13226) və «Şuabul-iman» (4/381, h.5477), Təbəraninin «Mucam əl-Kəbir» (9/25, h.8294) və «əl-Əvsat» (5/221, h.5140) və sairəni) tapa bildik. Onlardan biri də, İbn Hibbanın «Səhih» (1/185, hədis №9) əsərində Aişədən (A.o.r.) nəql etdiyi aşağıdakı hədisdir:*

(( إني لأخشاكم لله ، وأحفظكم لحدوده ))

*«Sizin ALLAHdan ən çox qorxanınız və Onun sərhədlərini ən yaxşı qoruyanınız Mənəm». (R.H.)*

[47] *Buxari, Kitabun-Nikah, Babut-Tərğibi fin-Nikah, 9/104, (5063) Ənəs b. Malik rəvayət etmişdir.*

[48] *Buxari, Kitabul-İman, 13/70 (20) – Aişənin (r.a.) hədisi.*

[49] *Bu hədisin Buxariyə nisbətləndirilməsinə baxmayaraq, onlar mətn baxımından fərqlidir. Beləki imam Buxarinin «Səhih»ində (Kitabul-İman, 13/70, h. №20) Aişədən (r.a.) olan hədis:*

(( إن أتقاكم وأعلمكم بالله أنا ))

*«Sizin ən təqvalınız və ALLAH barəsində ən yaxşı biləniniz Mənəm», prof. M. Xumeyyisin təqdim etdiyi rəvayət isə:*

(( إن أتقاكم لله وأعلمكم بحدود الله أنا ))

*«Sizin ən təqvalınız və ALLAHın sərhədlərini ən yaxşı biləniniz Mənəm» - mətni ilə təqdim edilmişdir. Hədisi imam Əhməd (Musnəd 5/434, hədis №23732), Abdurrazzəq (Musannəf 4/184, h. №7412), Əbu Yəla (Musnəd 7/401, h. 4427) və sairə hədis alimlərinin rəvayət etməsinə baxmayaraq, onu* ***«Təhavi əqidəsinin asanlaşdırılmış şərhi»*** *əsərindəki mətnə daha yaxın bir sözlərlə İbn Həzm «əl-Muhəllə» (Kitabus-siyəm, 6/142, məs: 753) kitabında nəql etmişdir. Həmin rəvayət belədir:*

(( أنا أتقاكم وأعلمكم بحدود الله ))

*«Mən sizin ən təqvalınız və ALLAHın sərhədlərini ən yaxşı bilənizəm» (R.H.)*

O, həqiqətən insanların ən şərəflisi və aləmlərin Rəbbinin sevimlisidir.

**ALLAH** Onu insanlar arasından arayıb seçmiş və Özünə yaxınlaşdırmışdır. Buna görə **ALLAH**ın Rəsulu (s.ə.s.) belə buyurur:

*«ALLAH İbrahimi Özünə dost götürdüyü kimi, məni də dost götürdü»*[52].

**ALLAH**ın Rəsulundan (s.ə.s.) sonra irəli sürüləcək bütün peyğəmbərlik iddiaları yolundan azmaq, çaşqınlıq, boş bir şey və batildir. Ondan başqa, kimsə özü və yaxud bir başqası üçün nəbilik iddiasında olan – kafirdir. Beləsini təsdiq edən də kafirdir. Buna şübhə edən də kafirdir. Mömin adam Ondan (s.ə.s.) sonra nəbinin gəlməyəcəyinə iman bəsləyər. Ondan (s.ə.s.) sonra bəzi yalançılar bu iddiada ola bilərlər. Hətta bəzi xarüqəladə şeylər nümayiş etdirə də bilərlər. Onların ardıcılları da ola bilər. Lakin ən az bir vaxtda onların həqiqi simasını hamı tanıyar və cəmiyyət qarşısında, eynilə bundan əvvəl də peyğəmbərlik iddiasında olanların yalanlarının aşkar olduğu kimsələr kimi, xəcalətli olarlar.

**32. O (s.ə.s.), bütün cinlərə və insanlara haqla, hidayətlə və aşkar göndərilmiş bir Nəbidir.**

---

[50] *Əhməd b. Hənbəl, Müsnəd, 3/2; ət-Tirmizi, Kitabuz-zühd, Babuş-şəfaəti, (3618) İbn Macə, Kitabuz-zühd, Babu Zikriş-şəfaəti, (4307), Əbu Səid əl-Xudrinin hədisi.*

[51] *Bu rəvayəti, tanınmış muhəddis Məhəmməd Nasirəddin Əlbani «Səhih hədislər silsiləsi» (4/99, hədis №1571) əsərində nəql edərək onun etibarlı olduğunu bildirmişdir. Nəzərinizə çatdırım ki, 50-ci sətiraltı qeyddə hədisin mənbəyi göstərilərkən səhvən: ət-Tirmizi, Kitabuz-zühd, Babuş-şəfaəti, (3618) – yazılmışdır. Beləki imam ət-Tirmizi bu hədisi: Kitabul-mənəqib (46), Bəbu fi fadlin-nəbi (1), hədis №3618 və Kitabu təfsirul-Quran (44), Bəbu və min surati Bəni İsrail (18), hədis №3148 – rəvayət etmişdir. (R.H.)*

[52] *Müslim, Kitabul-məsəcid, Babun-nəhyi an binəil-məsəcidi aləl-qubur, 1/377 (h. 532).*

## ŞƏRH

Rəsulullah (s.ə.s.) rəsulların ən ucalarındandır. O (s.ə.s.), Risaləti həm cinlərə və həm də insanlara gətirmişdir. Ondan əvvəlki peyğəmbərlərin gətirdikləri təkcə onların xalqına göndərilmişdi. Amma O (s.ə.s.) həm cinlərə, həm də insanlara peyğəmbər kimi göndərilmişdir. Uca **ALLAH**ın buyurduğu kimi:

□ ***Səni də** [ya Məhəmməd!] **aləmlərə** [bütün insanlara və cinlərə] **ancaq bir rəhmət olaraq göndərdik...*** □ ***(əl-Ənbiya, 107).***

**ALLAH**ın Rəsulu (s.ə.s.) belə buyurmuşdur:

*«Məndən qabaq göndərilən peyğəmbərlər ancaq onların öz xalqına göndərilirdi. Mən isə bütün insanlara göndərilmişəm»*[53].

Uca **ALLAH** Kitabında belə buyurur:[54]

□ ***Müşriklərin xoşuna gəlməsə də, islamın bütün dinlərdən üstün olduğunu göstərmək üçün Öz Peyğəmbərini doğru yolu göstərən rəhbərlə** [Quranla] **və haqq dinlə göndərən Odur!*** □ ***(əs-Səff, 9).***

**ALLAH** Onu (s.ə.s.) aydın və doğru yolla haqqa dəvət etmək üçün göndərmişdir. Uca **ALLAH** Kitabında belə buyurur:

□ ***Artıq ALLAH tərəfindən sizə bir nur və açıq-aydın bir kitab** [Quran] **gəldi*** □ ***(əl-Maidə, 15).***

Quran doğru yola aparan işıqdır. O, həm nur, həm də qəlblərə şəfadır.

## Xülasə

Məhəmməd (s.ə.s.) peyğəmbərimizdir. O (s.ə.s.), **ALLAH**ın seçilmiş bəndəsidir. Həm cinlərə və həm də insanlara hidayət və haqq dinlə göndərilmiş **ALLAH** elçisidir. Peyğəmbərlərin sonuncusudur. Ondan (s.ə.s.) sonra peyğəmbər

---

[53] *Buxari, Kitabut-təyəmmum, Babut-təyəmmum, 1/435 (335); Müslim, Kitabul-məsəcid və məvadius-saləti, 1/370 (521); Cabir b. Abdullahın hədisi.*

[54] *Ayənin subut gətirilməsinə səbəb türk tərcüməsində buraxılmış:*

وقد أرسله الله – تعالى – بالحق والهدى

***«Uca Allah Onu haqq və hidayətlə göndərmişdir»** - sözləridir. (R.H.)*

yoxdur. Əhli Sünnənin əsil əqidəsi budur. Bunu inkar edərək başqa bir peyğəmbərin gələcəyini gözləyən, yekdil rəyə əsasən kafir sayılır. [55]

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Allahın Elçisi (sallallahu aleyhi və səlləm) bütün cinlərə və insanlara və ya təkcə öz tayfasınamı Peyğəmbər göndərilmişdir?

2. Peyğəmbərdən (s.ə.s.) sonra bu ada iddia edənlərə hansı hökm verilmişdir?

3. Peyğəmbərin fərdi xüsusiyyətlərinə aid nə bilirsiniz?[56]



---

[55] *Orijinal olaraq əsaslandığımız (yəni, ər-Riyad, Dərul-Vətən nəşriyyatı, 1414 h.) kitabda: **«Əhli Sünnənin .....?????»** sözləri yoxdur. (R.H.)*

[56] *Əsaslandığımız ərəb orijinalında üçüncü sual yoxdur. Həmçinin ikinci sual:*

ما حكم من ادعى النبوة بعد رسول الله ، صلى الله عليه وسلم ، لنفسه أو لغيره ؟

***«Peyğəmbərdən (s.ə.s.) sonra nübuvvəti özü və ya başqası üçün iddia edənlərə hansı hökm verilmişdir?»** - kimi verilmişdir. Tərcümələri müqayisə et. (R.H.)*

# SƏKKİZİNCİ DƏRS

**33. Quran həqiqətən ALLAHın kəlamıdır. Ona məxsusdur. Mahiyyətini bilmədiyimiz bir keyfiyyətlə Ondan nazil olmuşdur. Öz Elçisinə onu vəhylə göndərmişdir. Möminlər isə onu həqiqət kimi təsdiq etmişlər. Onun doğrudan da ALLAHın sözü (danışığı) olduğuna iman gətirmişlər. O, bəndələrin danışığı kimi yaradılmamışdır. Kim Quranı dinləyib onun insan sözü olduğunu zənn edərsə, kafirdir. ALLAH belələrini Kitabında qınamış və onları Səqərlə (cəhənnəmlə) hədələmişdir.**

 ***Biz onu Səqərə atacağıq [****orada yandıracağıq****]***  ***(əl-Muddəssir, 26).***

**Uca ALLAH:**  ***Bu, yalnız bəşər sözüdür***  ***(əl-Muddəssir, 25)*** **- deyən şəxsləri Səqər ilə hədələdiyinə görə, bunun qəti olduğunu bilir və inanırıq ki, O, insanları yaradanın sözüdür və insan sözünə heç vəchlə bənzəmir.**

## ŞƏRH

Quran həqiqətən **ALLAH**ın sözüdür. Ona məxsusdur. Ancaq **ALLAH**ın necə danışdığını bilmirik. Lakin Onun danışması bir həqiqətdir. Kəlam **ALLAH**ın daimi sifətlərindən biridir.[57] Buna zidd olan əksi isə naqis sifətdir. **ALLAH**ı **o**nlardan uzaq sayırıq.

 ***...ALLAH Musa ilə sözlə [****arada heç bir vasitə olmadan****] danışdı***  ***(ən-Nisa, 164).***

«Kəlam» (danışıq), Onun gerçək bir sifətidir. Bu sifətin keyfiyyətini bilmirik. Onu ancaq Allah bilir və bu keyfiyyət Onun

---

[57] *Türk dilinə (yəni,* ***«Kelam, Allahın sabit bir sıfatıdır»****a) uyğun tərcümə edilmiş bu cümlə, əsərin ərəb orijinalında aşağıdakı kimidir:*

فالكلام صفة كمال ثابتة لله – تعالى –

***«Kəlam uca ALLAHın öz təsdiqini tapmış kamillik sifətidir».*** *Tərcümələri müqayisə et. (R.H.)*

qüdrətinə həqiqətən layiq bir keyfiyyətdir. Uca **ALLAH** Kitabında belə buyurur:

□ ***Əgər*** *[basqına uğrayan]* ***müşriklərdən biri səndən aman istəsə, ona aman ver ki, ALLAH kəlamını*** *[Quranı]* ***dinləsin. Sonra*** *[islamı qəbul etmədiyi təqdirdə]* ***onu əmin olduğu*** *[müşriklərin yaşadığı]* ***yerə çatdır*** □ ***(ət-Tövbə, 6)***. [58]

Burada məqsəd – Qurandır. O, həqiqətən **ALLAH**ın Kəlamıdır. Onu rəsulu Məhəmmədə (s.ə.s.) vəhy vasitəsi ilə nazil etmişdir. Möminlər isə onu təsdiq etmişlər. Quranın həqiqətən **ALLAH**ın Kəlamı olmasına yəqin bir elmlə inanmışlar.

O Quran yaradılmamışdır. Lakin sifətlər, ondan ayrı olmaq mənasında, zatından kənar deyillər. **ALLAH**ın sifətləri yaradılmamışdır, əbədidir. Bəşər sözü isə onların özü kimi yaradılmışdır. Quranın insan sözü olduğunu zənn və iddia edən hər kəs kafirdir. **ALLAH** belələrini cəhənnəm əzabıyla cəzalandıracağını bildirmişdir.

□ ***Və dedi: «Bu,*** *[başqasından]* ***öyrənilən sehrdən başqa bir şey deyildir! Bu, yalnız bəşər sözüdür. Biz onu Səqərə atacağıq*** *[orada yandıracağıq]* □ ***(əl-Mudəssir, 24-26).***

Uca **ALLAH** Qurana «bəşər sözü» deyənləri cəhənnəm əzabıyla cəzalandıracağını bildirmişdir. Möminlər Quranın bəşər sözü kimi yaradılmadığına iman gətirmişlər.[59] Onun sözü əlbəttə

---

[58] *Türk mətninə (yəni,* ***«Kelam (konuşma) sıfatı, Onun gerçek bir sıfatıdır. Bu sıfatın keyfiyetini bilemiyoruz. Onu ancak Allah bilir ve bu keyfiyet Onun Celaline layık olan bir keyfiyettir muhakkak. Allah Teala Kitabında şöyle buyuruyor: ...»*** *a) müvafiq olan bu tərcümə ilə, əsərin ərəb orijinalı:*

فالكلام صفة ثابتة له – سبحانه وتعالى – على الكيفية اللائقة بكماله وجلاله ، والقرآن كلامه ، كما قال – تعالى –: □ وإن أحد من المشركين استجارك فأجره حتى يسمع كلام الله ثم أبلغه مأمنه □

*arasında müəyyən fərqlər vardır. Onun düzgün hesab etdiyimiz ifadəsi aşağıdakı kimidir:* ***«Kəlam» (danışıq) Onun kamilliyinə və əzəmətinə layiq gerçək bir sifətidir. O pak və ucadır. Quran Onun kəlamıdır. Uca ALLAH belə buyurur: ... ».*** *Tərcümələri müqayisə et. (R.H.)*

[59] *Türk dilinə (yəni,* ***«Allahu Teala Kurana "beşer sözü" diyenleri Cehennem azabıyla korkutmuştur. Müminler, Kuranın beşer sözü gibi yaratılmamış***

insan sözünə bənzəməz. Əksinə **ALLAH**a aid olan bütün sifətlərinə dair deyirik ki, Allahın zatı bəndələrinin zatına bənzəmədiyi kimi, sifətləri də bəndələrinin sifətlərinə bənzəmir.

## Xülasə

Quran həqiqətən **ALLAH**ın Kəlamıdır (danışığıdır). **ALLAH** onu həqiqətən danışaraq demişdir. Cəbrail əleyhissəlam onu eşitmiş və Peyğəmbərin qəlbinə salmışdır.[60] Bundan belə anlamaq olar ki, Quran yaradılmayıb, **ALLAH**ın Kəlamıdır. Kim ki, bunun bəşər sözü olduğunu iddia edərsə, kafirdir.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Quran nədir?
2. «Quran yaradılmışdır» deyənə qarşı hansı hökm verilmişdir?



---

***olduğuna kesin olarak iman ettiler»****ə) uyğun çevrilmiş bu iki cümlə, əsərin ərəb orijinalındakı:*

فلما رأى المؤمنون كيف توعد الله بسقر من زعم أن القرآن كلام البشر ، علموا أنه كلام خالق البشر ...

*mənanı ifadə etmədiyi üçün onları bir daha tərcümə etdik:* ***«Möminlər Quranın «bəşər sözü» olduğunu güman edənləri ALLAHın Səqərlə cəzalandıracağını vəd etdiyini gördükdə, bildilər ki, bu Onun, bəşəri yaradanın kəlamıdır».*** *(R.H.)*

[60] *Türk mətninə (yəni,* ***«Allah onu gerçekten konuşmuş; Cibril Aleyhisselam onu işitmiş ve Rasulullahın kalbine indirmiştir»****ə) uyğun çevrilmiş bu cümlələr (yəni,* ***«ALLAH onu həqiqətən danışaraq demişdir. Cəbrail əleyhissəlam onu eşitmiş və Peyğəmbərin qəlbinə salmışdır»)*** *əsaslandığımız ərəb orijinalında yoxdur. (R.H.)*

# DOQQUZUNCU DƏRS

**34.** **«Uca ALLAHı insanlara məxsus sifətlərdən biri ilə təsvir edən hər hansı şəxs kafir olur. Kim öz bəsirət qabiliyyəti ilə bunu anlayarsa lazımi qaydada ibrət almış olur və kafirlərin sözlərinə oxşar sözlər söyləməkdən uzaqlaşır. Beləliklə, Uca ALLAHın sifətlərinin insanların sifətlərinə bənzəmədiyini qəti surətdə dərk edir».**

## ŞƏRH

Kim ki, Uca **ALLAH**ı Onun yaratdıqlarının sifətlərindən biri ilə vəsfləndirərsə və yaradılmışların keyfiyyətini Ona uyğun sayırsa, kafir olmuş olur:

 ***Ona bənzər heç bir şey yoxdur. O, [**hər şeyi**] eşidəndir, [**hər şeyi**] görəndir  (əş-Şura, 11).***

İnsan bunları görərək anlayarsa, mütləq kafirlərin onları küfrə batıra biləcək sözlərindən uzaq qaçacaqdır. Çünki **ALLAH** belələrini cəhənnəm atəşiylə cəzalandıracağını bildirmişdir.

Beləliklə, **ALLAH**ın sifətlərinin hər hansı bir formada insanların sifətlərinə bənzəmədiyini öyrəndik. [61]

---

[61] *Türk dilinə (yəni, «**Kim Allahu Tealayı yarattıklarından birisinin sıfatlarıyla sıfatlandırır ve Ona yaratılmışların keyfiyetini uyğun görürse, kafir olmuş olur: "Onun benzeri heç bir şey yoktur. O hakkıyla işiten, hakkıyla görendir" (eş-Şura: 11). İnsan bunu görür ve anlarsa, mutlaka kafirlerin onları küfre sokan sözlerinden kaçınacaktır. Zira Allah böylelerini Cehennem ateşiyle korkutmuştur. Böylece, Allahın sıfatlarının heçbir şekilde insanların sıfatlarına benzemedigini ögrenmiş olduk»**a) uyğun tərcümə edilmiş bu cümləl əri əsərin ərəb orijinalı ilə:*

أيما رجل وصف الله – تعالى – بمعنى من معاني البشر، وشبه الله بخلقه في معاني أسمائه وصفاته ، أو كيفيتها، فقد كفر بالله العظيم القائل:  ليس كمثله شيء وهو السميع البصير  وإذا رأى الإنسان هذا وفهمه وأدركه ، فإنه يعتبر من تكفير الله –تعالى – لمن شبهه بالبشر ، فإنه لابد سوف يعتبر، وينزجر عن أن يقول بمثل قول الكفار الذين حكم الله – تعالى – لهم بالنار، دار البوار، وسوف أن الله – تعالى – بصفاته ، وكيفيتها وحقيقة معانيها ليس كالبشر أبدًا .

## Xülasə

**ALLAH**ın sifətləri insanların sifətləri kimi deyildir. Onun Özünə verdiyi sifətlərini biz inkar edə bilmərik.[62] **ALLAH**ın sifətlərinin insanların sifətlərinə bənzədiyini iddia edən kafirdir.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. **ALLAH**ın sifətlərinin insanların sifətləri kimi olmadığına sübutlar hansılardır?
2. **ALLAH**ın sifətlərini insanların sifətlərinə bənzətmənin cəzası nədir?



---

*müqayisə etdikdə bir uyğunsuzluqlar aşkar edildi. Bu səbəbdən onları yenidən tərcümə etməyə səy göstərdik:* ***«Hər hansı bir insan Uca ALLAHı bəşər sifətlərindən biri ilə vəsfləndirərsə və Onu ad və sifətlərində və ya keyfiyyətlərində yaratdıqlarına bənzədərsə, əzəmətli Allaha qarşı küfr etmiş olur. O buyurur:  Ona bənzər heç bir şey yoxdur. O, [****hər şeyi****] eşidəndir, [****hər şeyi****] görəndir  (əş-Şura, 11). Əgər insan bunları gördükdə, anlayar və dərk edərsə, uca ALLAHı bəşərə bənzədənin Ona qarşı etdiyi küfrdən ibrət almış olur. O mütləq bundan ibrət almalı və kafirlərin sözlərinə oxşar kəlimələr söyləməkdən çəkinməlidir. Çünki uca ALLAH belələrinin cəhənnəm atəşində və həlak yurdunda yanmasına hökm vermişdir. O, uca ALLAHın heç vaxt Öz sifətlərində, keyfiyyətlərində və onların gerçək mənalarında bəşərə bənzəmədiyini (qiyamət günü – red.) biləcəkdir».*** *(R.H.)*

[62] *Türk dilinə (yəni,* ***«Onun kendisine verdigi sıfatları inkar edemeyiz»****ə) uyğun çevrilmiş:* ***«Onun Özünə verdiyi sifətlərini biz inkar edə bilmərik»*** *- sözləri əsərin ərəb orijinalında yoxdur. (R.H.)*

# ONUNCU DƏRS

**35. Cənnət əhlinin ALLAHı görməsi, əhatə edə bilmələri və, bizə görə, onun keyfiyyətini bilmələri mümkün olmadığından, Uca ALLAHın Kitabının bəyan etdiyi şəkildə bir gerçəklikdir:**

***O gün neçə-neçə üzlər sevinib güləcək, öz Rəbbinə baxacaqdır! (əl-Qiyamə, 22-23).***

**Bunun açıqlanması isə Uca ALLAHın istəyi və bilməsinə görədir. Peyğəmbərdən (s.ə.s.) bizə gəlib çatmış səhih hədislərdə də O, necə deyibsə, eləcə də olur. Bunun mənası isə Onun istədiyi kimidir. Biz bu mövzuda nəzər nöqtələrimizdə təvillərə[*] qapılmır, öz istəyimizə görə zənlərə qapılaraq veriləcək yozumlara girişmirik. Çünki (bu cür incəlikləri) Uca ALLAHa və Peyğəmbərinə (s.ə.s.) təslim edərək, özü üçün oxşar olanların biliyini bilənlərə həvalə edənlərdən başqa kimsə dinində salamatlığa yetişməz.**

## ŞƏRH

Möminlərin Qiyamət günü **ALLAH**ı öz gözləri ilə görəcəkləri Kitab və Sünnədə bildirilir.

***O gün neçə-neçə üzlər sevinib güləcək, öz Rəbbinə baxacaqdır! (əl-Qiyamə, 22-23).***

***Yaxşı işlər görənləri Cənnət və daha artıq mükafatlar [ALLAH**ın camalına tamaşa etmək**] gözləyir (Yunus, 26).***

**ALLAH**ın Peyğəmbəri (s.ə.s.) «daha artıq» (ayədəki «ziyadə» sözünü) «əziz və cəlil olan **ALLAH**ın camalına tamaşa etmək» kimi təfsir edir. **ALLAH**ın Peyğəmbəri (s.ə.s.):

**«Siz Rəbbinizi, on dörd günlük Ayı görməyə çətinlik çəkmədiyiniz kimi görəcəksiniz»**[63] deyə buyurur.[64]

---

[*] ***Təvil** – təfsir, izah, şərh (F.S.)*

[63] *Buxari, Kitabu Məvaqitis-Saləti, Babu Fadli Salətil-Əsri, 2/33 (54). Müslim, Kitabul-Məsəcid, Babu Fadli Saləteyis-Subhi vəl-Əsr, 1/439 (633). Cərir b. Abdillah rəvayət etmişdir.*

Bu ifadənin mənası heç də **ALLAH**ı *tam əhatə edən* görmə prosesini nəzərdə tutmur. **ALLAH** bundan uzaqdır. Lakin bu əslində həqiqi gözlə görmədir. Əsla qəlblə görülən ruhi yuxu anlamını vermir. Bu, cənnət əhlinin axirətdə əldə edəcəyi ən böyük nemətdir. Həmin mövzuda Peyğəmbərdən (s.ə.s.) bir çox hədis alimlərinin də bəyəndikləri kimi, mütəvatir* yolla gələn hədislər çoxdur. Bu ayə və hədislərin açıq mənalarının ifadə

---

[64] *Türk dilinə (yəni,* ***«Siz Rabbinizi ayın ondördünde ayı görmekte hiç zorlanmadığınız gibi, Onu göreceksiniz»*** *cümləsinə) uyğun tərcümə edilmiş bu hədis, əsərin ərəb orijinalında:*

إنكم سترون ربكم كما ترون هذا القمر لا تضامون في رؤيته

***«Siz Rəbbinizi, bu Ayı görməyə çətinlik çəkmədiyiniz kimi görəcəksiniz»*** *həmçinin Buxari və Muslimin «Səhih»lərində:*

كنا جلوسًا عند رسول الله صلى الله عليه وسلم إذ نظر إلى القمر ليلة البدر فقال : أما إنكم سترون ربكم كما ترون هذا القمر لا تضامون في رؤيته

***«Biz Peyğəmbərin (s.ə.s.) yanında oturmuşduq. Birdən O (s.ə.s.), bədirlənmiş gecədə çıxmış Aya baxaraq dedi: «Siz Rəbbinizi, bu Ayı görməyə çətinlik çəkmədiyiniz kimi görəcəksiniz»*** *- deyə verilmişdir. Aparılan bu müqayisədən göründüyü kimi əsli nüsxələrdəki «**bu Ayı»** ifadəsi türk dilinə «**on dörd günlük Ayı»** olaraq çevrilmişdir. Lakin onu da bildirim ki, rəvayətlə bağlı hədis kitablarından, Beyhəqinin «Sünənul-Kubra» (1/359, h. 1567, 2015), Əbu Davudun «Sünən» (h. 4729), İbn Məcənin «Sünən» (h.177), əl-Humeydinin «Musnəd» (2/350, h. 799), Təbəraninin «Mucamul-Kəbir» (2/294, h. 2224 – 2237), Nəsainin «Sünənul-Kubra» (1/176, h. 460 və 6/407, h. 11330), İbn Hibbanın «Səhih» (16/473, h. 7442), Əbu Əvanənin «Musnəd» (1/314) və sairəyə baxdıqda oxşar mənalı bir sıra mətnlər aşkar edildi. Məsələn, imam Tirmizinin «Sünən» (3/16, h. 2554) əsərində nəql etdiyi hədis:*

فإنكم سترون ربكم ؛ كما ترون القمر ليلة البدر، لا تضامون في رؤيته

***«Siz Rəbbinizi, bədrlənmiş gecədə doğmuş Ayı görməyə çətinlik çəkmədiyiniz kimi görəcəksiniz»,***

*Buxarinin «Səhih»indəki (Təfsir fəsli, Qaf surəsi, h. 4851) rəvayət isə:*

كنا جلوسًا ليلة مع النبي صلى الله عليه وسلم ، فنظر إلى القمر ليلة أربع عشرة فقال : إنكم سترون ربكم ، كما ترون هذا لا تضامون في رؤيته

***«Bir gecə biz Peyğəmbərlə (s.ə.s.) birgə oturmuşduq. O (s.ə.s.), on dördü gecəsi çıxmış Aya baxaraq dedi: «Siz Rəbbinizi, bu Ayı görməyə çətinlik çəkmədiyiniz kimi görəcəksiniz»*** *- sözləri ilə verilmişdir. (R.H.)*

* ***Mütəvatir*** *– çoxsaylı isnadlarla rəvayət edilən. (F.S.)*

etdikləri – möminlərin qiyamət günü **ALLAH**ı gözlə görə biləcəkləridir. Biz bu barədə gələn məlumatları qüsurlu baxışlarımızla dəyişdirmədən və öz bildiyimizlə onun doğruluğunun əleyhinə çıxmadan, olduğu kimi təsdiq edirik. Bu məlumatların həqiqiliyinə zidd çıxmaz, öz arzu və istəklərimizə uymarıq.

Müsəlman dinində azmaqdan və zəlalətdən özünü qorumaq istəyirsə, bizə doğru yollarla gələn dəlillərə əsaslanaraq **ALLAHın** və Peyğəmbərinin (s.ə.s.) hökmlərinə təslim olmalıdır. Hər hansı bir şeydə şübhəyə düşdükdə isə, onu **ALLAH**ın və Onun Peyğəmbərinin (s.ə.s.) öhdəsinə buraxmalıdır.

Əzəmət sahibi Uca **ALLAH** Kitabında belə buyurur:

 ***Ürəklərində əyrilik [****şəkk-şübhə****] olanlar fitnə-fəsad salmaq və istədikləri kimi məna vermək məqsədilə mütəşabih*** * ***ayələrə uyarlar (****tabe olarlar****). Halbuki onların həqiqi izahını ALLAHdan başqa heç kəs bilməz. Elmdə qüvvətli olanlar isə: «Biz onlara inandıq, onların hamısı Rəbbimiz tərəfindəndir»,- deyərlər. Bunları ancaq ağıllı adamlar dərk edərlər  (Ali-İmran, 7).***

**36. İslam ancaq təslim olmaq və itaət göstərməklə öz möhkəmliyini saxlaya bilər. Hər kim ki, özünün öyrənməsi mümkün olmayan şeyi öyrənməyə cəhd etdiyi halda təfəkkürü təslim olmaq kimi ruhi sabitliyə əsaslanmazsa, onun bu cəhdi pak tövhidi, təmiz mərifəti və sağlam imanı qazanmasına əngəl ola bilər. (Belə bir adam) vəsvəsələrə qapılmış, şaşqın, şübhə və tərəddüd içində, yolunu azmış halda imanla küfr, təsdiqlə təkzib, iqrarla inkar arasında dolaşar. Belə şəxs nə İslamı təsdiq edən bir mömin, nə də onu təkzib və inkar edən bir şəxsdir.**

## ŞƏRH

Quran və Sünnədən götürülmüş iqtibasları tam etiraf etmədən, onları təsdiq və itaətkarlıqla qəbul etmədən, istəklərinə

---

* ***Mütəşabih*** *– bir-birinə bənzəyən, oxşayan. (F.S.)*

uyub qəbul etdiyi ziddiyyətli və şübhəli fərziyyələrdən əl çəkmədən, ancaq məntiq və fəsadlı müqayisələrlə Quran və Sünnədən əxz edilmiş dəlillərə qarşı çıxmaq fikrindən uzaqlaşmadan İslamın buyurduğu kimi bir insan olmaq mümkün deyil.

Bir insan ki, öyrənilməsi mümkün olmayan və **ALLAH**ın hikməti və əmrlərindən ibarət olan gizli saxladığı bir elmi arayıb onunla kifayətlənmirsə, **ALLAH**ın istədiyinə və Onun Peyğəmbərinin (s.ə.s.) Sünnəsinə təslim olmursa, xalis tövhidin gerçəkliyini anlamaqdan, **ALLAH** haqqında doğru-dürüst biliyi olmaqdan, təsdiq və itaətlə bağlı səhih bir iman olan İslam yoluna qədəm qoymadan, ona tam təslim olmaqdan məhrum olur, səhih xəbərlərdən formalaşmış şəriət əqidəsinə mənsub mənbələrindəki imanla küfr, təsdiqlə inkar arasında vurnuxur. Beləcə də, o, hər cür vəsvəsələrin, boş xəyalların ardıyca çaşmış halda sürünəcək, məlum bir qərara gələ bilməyəcəkdir. O, nə həqiqətən kamil imanlı pak bir mömin, nə də İslamı tam mənasıyla inkar edən bir kafirdir. Çünki həqiqi iman onu təsdiq etmək və ona qeyd-şərtsiz təslim olmaqdan ibarətdir. Hətta hikmətini bilmədiyimiz mövzular da bu qəbildəndir. Belə ki, bu hikmətləri **ALLAH**dan və Peyğəmbərindən (s.ə.s.) bilik əldə etmədən anlaya bilmərik.

**37. İslam dünyasında bəzi şəxslərin ALLAHı *Cənnətdə görməni* təxəyyüllərinə və ağıllarına əsaslanaraq təfsir etmələri, ona düzgün baxışlı bir iman sayılmır. Çünki məsələyə mühakimə yolu ilə şərh vermək ALLAHın rəbliyinə əlavə edilən anlayışların hamısının təfsir edilməsi mənasını verir. Təfsirçilikdən əl çəkmək və itaət yoluna qədəm qoymaq müsəlmanlara xas olan dindir. "(Sifətələri) inkar etməkdən (funksiyasızlaşdırmaq) və oxşatmadan (bənzətmədən) çəkinməyən bir adamın ayağı sürüşər və (çatışmazlıq, eyb, qüsur və b. hallarla bağlı) mənəvi paklığa nail ola bilməz.**

**Şübhəsiz ki, Uca və Cəlil olan Rəbbimiz vəhdaniyyət sifətləri ilə təsvir edilmişdir. Bir və Tək olan sifətlərinə sahibdir. Yaratdıqlarından heç biri Onun sifətlərindəki mənalara malik deyil.**

## ŞƏRH

Müsəlmanlar arasından uca **ALLAH**ı görməni ağlına və istəklərinə görə şərh edən və yaxud özünün onun keyfiyyətini biləcəyini söyləyənlərin bu barədə əqidəsi düzgün əsaslara söykənmir. Belə insanlar xətaya yol verənlərdir. Röyətə (görməyə) tam mənasıyla əminliyi olmayanlardır. Çünki görmənin gerçəkliyini və keyfiyyətini **ALLAH**dan başqa heç kim bilə bilməz. Görmə (röyət) və yaradıcı Rəbbimiz haqqında edəcəyimiz ən doğru təfsir odur ki, insanlar (Onun sifətlərini), bu dünyada adət etdikləri şəkildə izah etməsinlər və keyfiyyət verməsinlər. Əksinə, bunun mənası (Quranda və Sünnədə) necədirsə, ona belə də iman gətirməliyik. Onun keyfiyyətini araşdırmamalıyıq. Bu mövzuda **ALLAH**ın və Peyğəmbərinin (s.ə.s.) buyurduqlarına iman gətirib təslim olmalıyıq.

Bu, Uca **ALLAH**ın Öz Peyğəmbəri ilə müsəlman qullarına göndərdiyi həqiqi dindir. Müsəlmana zəruri olan aşağıdakı iki şeydən çəkinmək lazımdır:

1. **ALLAH**ı Onun Özünü vəsf etdiyindən başqa tərzdə vəsf edərək haqq yoldan azmaq və **ALLAH**ın Özünü vəsf etdiyi əsil məqsədindən kənara çıxıb yayınmaq.

2. Uca **ALLAH**ın sifətlərini, adlarını, zatını və fəaliyyətini yaratdıqlarına bənzətmək.

 ***Ona bənzər heç bir şey yoxdur. O,** [hər şeyi] **eşidəndir,** [hər şeyi] **görəndir!**  **(Şura, 42/11).***

Ayənin birinci yarısı **ALLAH**a oxşarlığı və bənzərliyi inkar edir, ikinci yarısı isə Onun sifətlərinin isbatıdır. Ayə paklıqla isbatı bir yerdə nəzərdə tutmuşdur. Kim ki, bu iki haldan çəkinməzsə, ayağı sürüşər və imanında xətaya yol verər, həqiqəti tapa bilməz. Beləcə də, **ALLAH** haqqında vacib olan paklıq yerinə yetirə bilməz. Bu, **ALLAH**ı oxşarlıqdan, bənzərlikdən və şərik qoşmaqdan uzaq tutmaqdan ibarətdır. Çünki əziz və cəlil olan **ALLAH** əməlində, adlarında, sifətlərində, yaradıcılığında və hökmlərində vəhdaniyyət sahibidir. Bütün fəaliyyətində Təkdir. Heç kimə ehtiyacı yoxdur. Onun şəriki və

bənzəri yoxdur. Yaratdıqlarının heç biri bu mənalarda zatında, əməllərində, adlarında və sifətlərində Ona bənzəməzlər.

**38. O, hüdudlardan və ölçülərdən ucadır. O, dayaqlar, orqanlar və vasitələrdən xalidir. Altı cəhəf, Onun sonradan yaratdığı digər məxluqları əhatə etdiyi kimi, Onu əhatə edə bilməz.**

## ŞƏRH

**ALLAH** təala hüduddan, ölçülərdən ucadır və uzaqdır. **ALLAH**ın nə həddi var, nə də hüdudu. Bu Onun yaratdıqları ilə birləşmiş olması mənasını vermir. O, yaratdıqlarından tamamilə fərqlidir.

Həm də, əziz və cəlil olan **ALLAH** dayaqlardan, orqanlardan və alətlərdən uzaqdır. Bunlar Onun qullarına məxsus orqanlar və iş alətləridir. İnsanlar bunların vasitəsilə özlərinə yararlı olan şeyləri mənimsəyir, zərərliləri isə rədd edirlər. Belə şeylərin **ALLAH** üçün əhəmiyyəti yoxdur.

Beləliklə biz **ALLAH** təalanın bizə çatmış bütün adları və sifətləri dəyişdirmədən qəbul edirik. Bunlara sübut olacaq bir həqiqət vardır. Biz bunun mənasını qavrayır və **ALLAH**a layiq tərzdə qəbul edirik. Fəqət biz bunların keyfiyyətini izah etməyə çalışmırıq. Çünki bu adları və sifətləri **ALLAH** Özü Özünə vermişdir. Böyük və əzəmətli **ALLAH**ı özünə sığışdıra biləcək heç nə yoxdur. **ALLAH** bunlardan uzaqdır.

Bunları deyərkən cəhətləri tamamilə inkar etmirik. Çünki böyük və əzəmətli **ALLAH** hər şeydən yüksəkdədir. Ucalığın Sahibidir. Heç bir güc Ona qalib gələ bilməz.[65]

---

[65] *Türk dilinə (yəni,* ***«Hiç bir güc Onu kuşatamaz»****a) uyğun tərcümə edilmiş bu ifadəni əsərin ərəb orijinalında tapa bilmədik. Onun yerində olmalı digər ixtisar edilmiş cümlə isə, aşağıdakı kimi idi:*

لكن المقصد أنه – سبحنه – لا تحويه الجهات و تحيط به كما في سائر المخلوقات

***«Lakin məqsəd budur ki, cəhətlər nöqsansız ALLAHı yaradılanlarda olduğu kimi özünə sığışdıra və əhatə edə bilməzlər».*** *(R.H.)*

Biz arzu edərdik ki, Təhavi anlayışları kəlam elmi əsasında nəzərdə tutmayaydı. O, bu anlayışlarla kəlamçıların dedikləri və həqiqətdə güddükləri məqsədi güdməmişdir, "üz" və "üluv" kimi sifətləri **ALLAH** təalaya görə isbat etməsinə baxmayaraq, bu anlayışları işlətməsəydi daha yaxşı olardı. Ancaq bundan daha yaxşısı onun kəlamçılara məxsus olan bu anlayışları heç işlətməməsiydi. Çünki o anlayışlar həm haqqı və həm də batili özündə ehtiva edir.

Sünnə və camaat əhlinin məslək etiqadı haqqında rəy söyləmək, bu mövzuya aid hökm təfərrüatı ilə araşdırıldıqdan sonra mümkündür. Məsələn: "**O, hüdudlardan və ölçülərdən ucadır**" ifadəsini deyən şəxs bunula **ALLAH** təalanı heç bir şeyin əhatə edə bilməyəcəyini və mövcud olan heç nəyin Ona sərhəd ola bilməyəcəyini nəzərdə tutursa, bu – haqdır. Lakin bu deyimlə **ALLAH**ın, ucalığı baxımından, ən uca mövqeyə Sahib olmaması söylənirsə, onda bu vəziyyətdə batil olan bir ifadə işlədilimiş olur. Çünki, bu mənada **ALLAH**ın yaratdıqlarından uca olmadığı iddia edilir.

"Orqanlardan və alətlərdən uzaqdır" ifadəsi ilə **ALLAH**ın bir üzü, iki əli, iki gözü kimi əlamətlərlə yaratdıqlarının üzlərinə və sifətlərinə oxşamadığı deyildikdə, bu həqiqətdir. Lakin bununla **ALLAH**ın üzünün (simasının) və iki əlinin olmadığı iddia edildikdə isə, bu, doğru deyildir.

"Onu altı cəhət əhatə edə bilməz" ifadəsiylə Uca **ALLAH**ın altı tərəfdən hər hansı birisində olmadığı demək istənilirsə, bu söz doğru deyildir, batildir.[66] Çünki bu olmayan bir

---

[66] *Türk dilinə (yəni,* ***«"Onu altı yön kuşatamaz" sözüyle eger ALLAHu Tealenin altı yönden herhanqi birisinde olmadığını söylemek istiyorsa, bu söz batildir. Çünkü bu, yok olan bir şeyin sıfatıdır. Bu açık bir küfürdür»*** *ə) uyğun çevrilmiş bu ifadənin ərəb orijinalına:*

إن أراد أن الله تعالى ليس في جهة من الجهات ولا فوق ولا تحت ولا يمين ولا شمال ولا خلف ولا أمام فهذا باطل لأن هذا صفة معدوم بل صفة ممتنع وهذا كفر صريح لأنه نفي لقول الله تعالى بل نفي لوجوده سبحانه

*müvafiq olan tam tərcüməsi aşağıdakı kimidir: «****"Onu altı cəhət əhatə edə bilməz" ifadəsiylə Uca ALLAHın altı tərəfdən hər hansı birisində, nə***

şeyə məxsus sifətdir ki, əslində açıq bir küfrdür. Amma əgər o ifadəylə **ALLAH**ın mövcud şeylərin hər hansı tərəfləri ilə məhdudlaşdırılmadığı söylənirsə, bu həqiqətdir. **ALLAH** doğrusunu daha yaxşı bilir.

## Xülasə

Uca **ALLAH** Qiyamət günündə adi gözlə görülür. Möminlər Onu həqiqətən görəcəklər, amma Onu qətiyyən əhatə edə bilməzlər. Bu, Sünnə əhlinin etibarlı mənbələrdən qazandığı inancdır. Hər bir müsəlmanın təvildən*, kəlamçılıqdan**, **ALLAH**ın sifətlərini yozmaqdan və yozanlardan uzaq olmağı vacibdir. Eyni zamanda Uca **ALLAH**ın yaratdıqlarından və onlara bənzəməkdən uzaq olduğunu hər bir müsəlmanın bilməsi zəruridir.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Uca **ALLAH**ı Qiyamətdə görmənin əsasında duran nədir?
2. Ayə və hədislərdə bildirilən sifətlər haqqında müsəlman üçün vacib olan nədir?
3. Təhavinin **"ALLAH**ı altı cəhət əhatə edə bilməz" ifadəsini necə başa düşürsünüz?



***yuxarıda, nə aşağıda, nə sağda, nə solda, nə arxada, nə də öndə olmadığı demək istənilirsə, bu söz doğru deyildir, batildir. Çünki bu olmayan bir şeyə məxsus sifətdir ki, əslində açıq bir küfrdür. Axı bununla nəinki uca ALLAHın kəlamı, hətta Onun varlığı inkar edilir».*** *(R.H.)*

* ***Təvil*** *– burada: öz bildiyi kimi yozma, təfsir etmə mənasında. (F.S.)*

** ***Kəlamçılıq*** *– Quran ayələrinin (hədislərə istinad etmədən) təfəkkür əsasında şərh edilməsi (F.S.).*

# ON BİRİNCİ DƏRS

**39. Merac həqiqətdir. Peyğəmbər (s.ə.s.) gecə vaxtı aparılmışdır. Oyaq olduğu halda maddi bədəniylə merac yolu ilə səmalara qaldırılmışdır. Sonra isə Uca ALLAHın istədiyi yüksəkliklərə çıxarılmışdır. ALLAH peyğəmbərinə istədiyi hörməti göstərmiş və bildirmək istədiyi şeyləri ona xəbər vermişdir.** *** Qəlb** [Peyğəmbərin qəlbi] **gördüyünü yalan saymadı…** **(Nəcm, 11).*** **Dünyada da, axirətdə də Peyğəmbərə (s.ə.s.) Uca ALLAHın salət və salamı olsun!**

## ŞƏRH

Əhli Sünnə və camaat **ALLAH**ın Peyğəmbərinin (s.ə.s.) öz şəxsiyyəti, bədəni və ruhu ilə birgə isra* gecəsi meraca çıxmasına iman gətirmişlər. *İsra* Quran, Sünnə və alimlərin yekdilliklə qəbul etdiyi rəylə təsdiq edilir. İsra Məkkədən Beytül Müqəddəsə doğru həyata keçirilmişdir.

*** Bəzi ayələrimizi** [qüdrətimizə dəlalət edən qəribəlikləri və əcaiblikləri] **göstərmək üçün bəndəsini** [Peyğəmbər əleyhissəlamı] **bir gecə** [Məkkədəki] **Məscidülhəramdan ətrafını mübarək etdiyimiz** [bərəkət verdiyimiz] **Məscidüləqsaya** [Beytülmüqəddəsə] **aparan ALLAH pak və müqəddəsdir. O, doğrudan da,** [hər şeyi] **eşidən və biləndir** **(İsra, 1).***

**ALLAH**ın Elçisi (s.ə.s.) orada peyğəmbərlərə imamlıq edərək namaz qıldırdı. Beləliklə, Onun (s.ə.s.) göyün yeddinci qatına şərəfli vücuduyla getməsi (merac) gerçəkləşdi. Oradan Sidrətülmüntəhaya*, oradan isə Cənnətülməvaya** aparıldı.

---

* ***İsra –*** *"gecə vaxtı getmək və yola çıxmaq" felinin məsdəridir (İsra,1). Ayədə Məhəmməd peyğəmbərin Məkkədən* [*Məscidülhəramdan*] *Qüdsə* [*Məscidüləqsaya*] *gecə səyahəti nəzərdə tutulur. Quran-Kərim, Bakı, Z.Bunyadovun və V. Məmmdəliyevin tərcüməsi, səh. 631 (F.S.).*

* *Göyün yeddinci qatında təsvir olunan yerin adıdır (F.S.).*

Uca **ALLAH**, bu qaydayla istədiyi kimi Onunla (s.ə.s.) orada bir vasitə olmadan danışdı. **ALLAH** Ona (s.ə.s.) istədiyi kimi ehtiram göstərdi. O (s.ə.s.), heç kimin ucalmadığı bir məqama ucaldı. **ALLAH**la danışdı. **ALLAH** Ona Cənnət və Cəhənnəmdəki şəraiti göstərdi. Ona (s.ə.s.) istədiklərini vəhy etdi. Ona (s.ə.s.) bir gecə-gündüz ərzində beş dəfə qılınacaq fərz namazları haqqında bilgi verdi.[67] Peyğəmbər (s.ə.s.) gördüklərini həqiqətən öz gözləri ilə gördü. Bu da, Ona (s.ə.s.) digər elçilərdən fərqli olaraq, **ALLAH**ın bir ehtiramı, Onun (s.ə.s.) uca tutulmasının təzahürü idi. Bu gecə baş verən hadisələrin hamısı **ALLAH**ın Elcisindən (s.ə.s.) «Səhiheyn» və qeyrilərində dəqiqliklə nəql edilmişdir.

**40. Uca ALLAHın Ona (s.ə.s.) ehtiramı və ümmətinə bir kömək forması kimi səxavətliliyinin nəticəsi olan Hovuz isə haqqdandır.**

## ŞƏRH

**ALLAH** Elçisindən (s.ə.s.) bizə çatan hədislərdə hovuzun mövcud olması həqiqətən təsdiq edilir. Hovuz hədisləri, elm əhlinin açıqladığı kimi, mutəvatirdir.

Hovuz Cənnət çaylarından qidalanan bir göldür. Suyu süddən ağ, baldan dadlı, qoxusu isə müşkdən də gözəldir. Onun eni ilə uzunluğu eynidir. Bir bucağından o biri bucağınadək məsafə bir aya qət edilir. Qədəhləri göy üzünün ulduzları kimidir. Ondan bir qurtum içən bir də heç vaxt susamaz. O, Qiyamət gününün ən böyük və ən dadlı hovuzudur və içənləri ən çoxdur. O, Qiyamət gününün susuzluğundan Məhəmməd ümmətinin qurtuluşudur.

---

[**] *Behişt kimi gözəl bir yer (F.S.)*

[67] *Əsərin orijinal nüsxəsinə baxdıqda aşağıdakı cümlənin türk tərcüməsində olmadığı aşkar edildi:*

وما كذب فؤاد النبي ، صلى الله عليه وسلم ، ما رأى

***«Peyğəmbərin (s.ə.s.) qəlbi gördüyünü yalan saymadı»*** *(R.H.)*

Bu, Allahın Elçisinin (s.ə.s.) digər peyğəmbərlər arasında sahib olduğu fəzilətinə görə **ALLAH**ın Ona (s.ə.s.) ehtiramının nəticəsidir. **ALLAH** hamımızı Qiyamət günü Onun Hovuzundan içənlərdən etsin!

## Xülasə

Məkkədən Beytülmüqəddəsə edilən gecə səyahəti hadisəsi həqiqətdir. Səmaya qalxmaq mənasını verən merac da həqiqətdir. Peyğəmbərə (s.ə.s.) səmada vəhy edilənlər də həqiqətdir.[68] Bu barədə **ALLAH**ın Elçisindən (s.ə.s.) səhih hədis gəlmişdirsə, hamısı həqiqətdir. Əhli Sünnə kimi onların hamısına inanırıq.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. İsra hadisəsini inkar edənə qarşı hansı hökm verilir?
2. İsra haradan haraya həyata keçirilib? Merac haradan haraya olub?
3. **ALLAH**ın Elçisinin (s.ə.s.) Qiyamətdəki hovuzu haqqında nə bilirsiniz?



---

[68] *Əsərin əsli nüsxəsinə baxdıqda aşağıdakı:*

والحوض حق

***Hovuz həqiqətdir -** sözlərinin türk tərcüməsində olmadığı, **«Ehli Sünnet olarak hepsine inanıyoruz»** cümləsinin isə orijinala əlavə edildiyi aşkar olundu. (R.H.)*

# ON İKİNCİ DƏRS

**41. Xəbərlərdə nəql edildiyi kimi Reyğəmbərin (s.ə.s.) ümməti üçün saxladığı şəfaəti həqiqətdir.**

**42. ALLAHın Adəm əleyhissəlam və Onun nəsli ilə bağlamış olduğu *əhd* həqiqətdir.**

## ŞƏRH

Peyğəmbərin (s.ə.s.) şəfaəti* bir neçə növdür. **ALLAH** Elçisinin (s.ə.s.) ən böyük şəfaəti isə, məşhərdəki şəfaətidir. **ALLAH** o gün onların arasındakı çəkişmələri araşdırar. Uca **ALLAH Öz** Elçisinə (s.ə.s.): "…şəfaət istə, şəfaətçi ediləcəksən"[69], deyə buyurur. Bu şəfaət şək-şübhə edilməyəcək dərəcədə dəlillərə əsaslanır və həqiqətdir. Habelə, **ALLAHı**n Elçisi (s.ə.s.) ümmətindən pislikləri yaxşılıqlarına bərabər olanlara şəfaət verəcəkdir. Bir də **ALLAHı**n Elçisi (s.ə.s.) Cəhənnəmə düşmələrinə hökm verilməsinə baxmayaraq Onun şəfaətilə Cənnətə düşənlərə də şəfaətçi olacaqdır. **ALLAHı**n Elçisinin (s.ə.s.) bir başqa şəfaəti də Cənnətə girənlərin dərəcələrinin yüksəldilməsindən ötrü olacaqdır. Peyğəmbər (s.ə.s.) ümmətindən, şəfaət etdikdən sonra, hesabı soruşulmadan Cənnətə girənlər də var. Onun (s.ə.s.) başqa bir şəfaəti isə, Cəhənnəm əzabına düçar olunduqlarına qərar verildiyi halda, əzablarının yüngülləşdirilməsi üçün şəfaət verəcəyi şəxslər üçün nəzərdə tutulmuşdur. Bir də, bütün möminlərin Cənnətə daxil olmaları üçün şəfaət verəcəkdir. Peyğəmbər (s.ə.s.) ayrıca olaraq, ümmətindən, böyük günahlarından ötrü, Cəhənnəmə atılmasına qərar verilmiş olanlara da şəfaətçilik edəcəkdir.

---

* ***Şəfaət*** *– günahkarın bağışlanması üçün vasitəçilik (F.S.).*

[69] *Buxari, Kitabut-tövhid, "Əziz və cəlil Rəbbin kəlamı" fəsli, 13/473 (h.7510), Müslim, Kitabul-iman, 1/182 (h.326). Hər ikisi Ənəs b. Malikdən rəvayət etmişlər.*

Bu şəfaət növlərinin hamısı həqiqət və gerçəkdir. Bunların hamısı **ALLAH**ın Elçisindən gələn səhih hədislərlə təsdiq olunur. Lakin bu şəfaətlərin heç biri **ALLAH**ın icazəsi olmadan gerçəkləşməyəcəkdir.

□ ***De ki: "Bütün şəfaət yalnız ALLAHa məxsusdur*** □ ***(Zumər, 44).***

□ ***…Onlar yalnız ALLAHın razı olduğu*** *[izn verdiyi]* ***kəslərdən ötrü şəfaət edə bilər…*** □ ***(Ənbiya, 28).***

□ ***Onun hüzurunda, izn verdiyi kimsələr istisna olmaqla, heç kəsin şəfaəti fayda verməz…*** □ ***(Səba, 23).***

Vəd də həqiqətdir. Bu, **ALLAH**ın, Adəm əleyhissəlamın kürəyinə əlini çəkərək, ondan və Qiyamət gününədək doğulub törəyəcək nəslindən aldığı bir sözdür. **ALLAH** onların nəfslərindən Rəbləri barədə şahidlik etmələrinə söz almışdır.

Onlar da şəhadət vermiş və bunu təsdiq etmişlər. Uca **ALLAH** bunu Kitabında belə buyurur:

□ *[Ey Peyğəmbərim!]* ***Xatırla ki, bir zaman Rəbbin Adəm oğullarının bellərindən*** *[gələcək]* ***nəsillərini çıxardıb onları özlərinə*** *[bir-birinə]* ***şahid tutaraq: "Mən sizin Rəbbiniz deyiləmmi?" – soruşmuş, onlar da: "Bəli, Rəbbimizsən!" – deyə cavab vermişdilər.*** *[Belə bir şahidliyin səbəbi]* ***Qiyamət günü: "Biz bundan qafil idik"…deməməniz üçündür*** □ ***(Əraf, 172).***

## Xülasə

Peyğəmbərin (s.ə.s.) Axirətdə öz ümməti üçün şəfaətçi olması həqiqətdir. **ALLAH**ın Adəm əliyhissəlamdan və Onun nəslindən olanlardan vəd alması həqiqətdir.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Axirətdəki ən böyük şəfaət sahibi kimdir?
2. Şəfaətin növləri hansılardır?

3. **ALLAH**ın Adəm əleyhissalamdan və onun nəslindən aldığı vəd nədir?[70]



## ON ÜÇÜNCÜ DƏRS

**43. Uca ALLAH əzəldən bəri Cənnətə girməli olanların sayı ilə Cəhənnəmə girməli olanların hamısının sayını öncədən bilirdi. Bu saya nə bir əlavə edilir, nə də ondan bir şey azaldılır.**

**44. Daha sonra, insanların hansı əməllər edəcəklərini də eynilə bilirdi. Kim nə üçün yaradılmışsa, ona müyəssər olar. Hər insan nə üçün yaradılıbsa, ona uyğun əməl işlədər. Əməllər son nəticələrlə müəyyənləşdirilir. Xöşbəxt olan şəxs ALLAHın qəza-qədərinə görə xöşbəxt olursa, bədbəxt olan kimsə də ALLAHın qəza-qədərinə görə bədbəxt olur.**

### ŞƏRH

Uca **ALLAH** əzəldən elmi ilə Adəm oğullarından Cənnətə və Cəhənnəmə girməli olanların hamısının kimliyini bilir. O, bunu bütün təfərrüatı ilə bilir. Onların sayı nə arta və nə də azala bilməz.

**ALLAH**, insan hələ ana bətnində ikən onun iman əhlimi və ya küfr əhlimi olduğunu bilir. Bu, Lövhi-məhfuzda yazılmışdır. Uca **ALLAH**ın bu haqda biliyi heç vaxt dəyişilməz.

Daha sonra, qullarının əməllərini də onlar fəaliyyətə başlamazdan əvvəl Ona məlumdur. Bu, **ALLAH**ın əzəli elmindən irəli gəlir. Bunları beləcə yazaraq təqdir etmiş və beləcə də hökm

---

[70] *Türk dilinə (yəni, **«Allahın Adem Aleyhisselamdan ve zürriyetinden aldığı misak nedir»** cümləsinə) uyğun tərcümə edilmiş bu ifadə, əsərin ərəb orijinalında aşağıdakı kimi verilmişdir:*

3) ماذا تعرف عن الميثاق الأول ؟

***«Birinci vəd haqda nə bilirsən?»** (R.H.)*

vermişdir. Hər insan nə üçün yaradılıbsa, ona uyğun əməl işlədər. Cənnət əhli Cənnətə uyğun əməlləri gerçəkləşdirər, Cənnət əhlinin əməlinə görə hərəkət edər. Cəhənnəm əhli isə Cəhənnəmə məxsus əməlləri gerçəkləşdirər. Əməllər niyyətə və necə sonuclanmasıyla müəyyən edilir.

Hər hansı bir adamın pis əməlindən sonra yaxşı əməli təqdir edilirsə, o, yol verdiyi həmən pislikdən sonra Cənnətə düşə bilər. Bəzi elələri də vardır ki, əvvəllər yaxşı əməllər işlətdiyi halda, ömrünü Cəhənnəm sakinlərinin əməllərilə bitirərək, Cəhənnəm əhli sırasına yazılır. Əhəmiyyətli olanı, insanın son anda işlətdiyi əməldir*.

Mömin ancaq **ALLAH**ın istəyi ilə mömin olur. Kafir də eləcə **ALLAH**ın istəyi ilə kafir olur. Bunu **ALLAH** yaratmış və təsdiq etdiyini də bildirmişdir. **ALLAH** iman əhlini "iman əhlindən", kafirləri isə "küfr əhlindən" müəyyən etmişdir. Uca **ALLAH** Kitabında belə buyurur:

 ***ALLAH gördüyü işlər barəsində sorğu-sual olunmaz; onlar** [bütün bəndələr] **isə** [tutduqları əməllərə görə] **sorğu-sual ediləcəklər  (Ənbiya, 23).***

**45. Qədərin mahiyyəti ALLAHın yaratdıqları haqqındakı sirridir. Bu həqiqəti nə bir yaxın mələk, nə də elçi göndərilmiş bir peyğəmbər bilməmişdir. Bu barədə dərinliyə dalmaq və bilmək üçün çox düşünmək ilahi köməyindən uzaqlaşmaya aparan yoldur, ALLAHın mərhəmətindən məhrum etməyə yol açan nərdivan, azğınlığa aparan pillədir. Bu baxımdan, bu barədəki müqayisənin düşüncələr və vəsvəsələr vasitəsilə əldə olunacaq nəticələrindən çəkinmək lazımdır. Çünki Uca ALLAH**

---

* *Qüdrətli və əzəmətli **ALLAH**ın təqdiri, elmi əzəlidir. Uca **ALLAH** əzəli elmiylə xəlq etdiklərinin edəcəkləri işləri bildiyinə görə Qədəri yazmışdır. İnsanlar Uca **ALLAH**ın onlara verdiyi cüzi iradə ilə xeyri və ya şəri, hidayəti və ya zəlaləti seçərlər. Uca **ALLAH**, qədəri məhz belə yaradır. Qədər insana bildirilməmişdir. Buna görə, insan, "qədərim (taleyim) yazılıb, mən onu yaşayıram, ona cavabdeh deyiləm" deyə bilməz. **ALLAH**ın qədəri yazması qullarının nə edəcəklərini irəlicədən bildiyinə görədir. (M.E. Akın)*

**qədər elmini yaratdıqlarından qapalı saxlamışdır. O barədə mübahisə etməyi də qadağan etmişdir. Beləliklə, Uca ALLAH Kitabında belə buyurur: *ALLAH gördüyü işlər barəsində sorğu-sual olunmaz; onlar* [*bütün bəndələr*] *isə* [*tutduqları əməllərə görə*] *sorğu-sual ediləcəklər* (Ənbiya, 23). Buna görə də kim ki: "Niyə belə edib?" – deyə soruşarsa, Kitabın hökmünü inkar etmiş olar. Kitabın hökmünü inkar edənlər isə kafir olar.**

## ŞƏRH

Qədərin mahiyyəti **ALLAH**ın sirridir. Onu heç bir insan bilə bilməz. Bu mövzuda dərinliyə dalmaq və qədərin əslinə çatmaq cəhdləri düzgün deyil. Belə ki, **ALLAH**ın Peyğəmbəri (s.ə.s.) də belə buyurmuşdur:[71] *"Qədərdən bəhs edildikdə, susun!"* [72]

Kim qədərin gerçəkliyini anlamaq istərsə, bilsin ki, gedəcəyi yol ziyan və məhrumiyyətlər yolu olacaqdır. O, bu yolu bacarıqla gedə bilməyəcək və həm də **ALLAH**ın hidayətindən məhrum olacaqdır. Qəzaya düçar olacaq və həddini aşacaqdır. Çünki qədərin mahiyyətini Uca **ALLAH**dan başqa kimsə bilməyə qadir deyil. İnsanlar nə qədər düşünürlərsə də düşünsünlər, qədərin həqiqətinə yetişə bilməyəcəklər. Bizsə, Uca **ALLAH**ın hər şeyi bildiyinə və yazısına iman gətiririk. Bu, qədəri başa düşməmiz üçün bizdən tələb olunan dörd dərəcədir. Əks təqdirdə insanın qədərə inanmadığı hesab olunur. [73] Müsəlmanın yerinə

---

[71] *Ət-Təbərani, əl-Mucəmul-Kəbir, 10/223-224; Əbu Nueym, əl-Hilyə, 4/108. Hər iki rəvayət Əbu Vail vasitəsilə ibn Məsuddan gəlmişdir. Əl-Ləlakai, Şərhu usulil-İtiqad, 1/126 və Əlbani də «Silsilətul-əhadisis-səhihə»də (1/46) buna səhih hədis demişdir. (M.E. Akın)*

[72] *Əsərin ərəb orijinalına baxdıqda hədisin digər mənbələrinin yazılmadığı, Əlbaninin isə «Səhih hədislər silsiləsi»ndə (1/75, h.34) ona səhih deyil, «həsən-liğeyrihi» (yəni, zəifliyi ehtimal olunan rəvayətlərin cəm edilməsi ilə, etibarlıdır – red.) deməsi aşkar olundu. (R.H.)*

[73] *Türk dilinə (yəni,* ***«Ancak biz, Allahu Tealanın herşeyi bildigine, yazdığına iman ediyoruz. Bu, kaderin anlaşılması için bilmemiz gereken dört derecedir.***

yetirməsi zəruri olan şey qədərə dair düşüncələrə dalmaqdan çəkinmək və vəsvəsələrə təslim olmamaqdır. Bilmək lazımdır ki, **Allah** qədər haqqında bilikləri qullarından gizlətmiş və onları qədərin həqiqətlərini araşdırmaqdan daşındırmışdır:  ***ALLAH gördüyü işlər barəsində sorğu-suala olunmaz; onlar isə sorğu-sual ediləcəklər  (Ənbiya, 23).*** Qulun, "**ALLAH** bunu nə üçün etdi?"- deyə sual verməsi caiz deyil. Çünki belə anda o, Quranın hökmünü inkar etmiş sayılır ki, bu da açıq-aydın küfrdür. Lakin insanın bu və ya digər hökmün arxasındakı ilahi hikmətləri tədqiq etməsində hər hansı bir maneə yoxdur.

**46. Belə ki, bu, Uca ALLAHın dostlarından (vəli qullarından) qəlbləri Onun nuru ilə işıqlanmış insanların lazım bildiyi şeylərin xülasəsidir və bu, elmdə dərinliklərə varmışların səviyyəsidir. Elm iki növdür: birincisi yaradılmışlar arasında olan (bilinən) bir elmdir, digəri isə yaradılmışlar arasında olmayan (qapalı olduğu üçün bilinməyən, sirli qalan) bir elmdir. Mövcud olan elmin inkarı küfrdür, olmayan elmi bilmək iddiasında olmaq da küfrdür. İman (bilinən elmi qəbul edib), bilinməsi mümkün olmayan elmi əldə etmək cəhdini tərk etmədikcə təsdiq edilmir.**

## ŞƏRH

---

***Aksi takdirde insan kadere inanmamış olur»*** *sözlərinə) uyğun çevrilmiş bu ifadədə dörd dərəcədən yalnız ikisi,* ***«uca ALLAHın hər şeyi bilməsi və yazısına iman gətirmək»*** *qeyd edilmişdir. Əsərin ərəb orijinalına baxdıqda isə, türk tərcüməsinin ixtisarla verildiyi məlum oldu. Onun tam tərcüməsi aşağıdakı kimidir:*

غير أننا نؤمن بأن الله – تعالى – علم كل شيء ، وكتبه ، وأراده ، وخلقه ، وأوجده ، فهذه أربعة مراتب للقدر لابد من استيفائها وإلا لم يكن الإنسان مؤمنًا بالقدر .

***«Bizsə, Uca ALLAHın hər şeyi bilməsinə, yazmaısına, istəməsinə və yaradıb var etməsinə iman gətiririk. Bu, qədərin dörd dərəcəsidir. Onların hamısını qəbul etmək zəruridir. Əks təqdirdə insanın qədərə inanmadığı hesab olunur».*** *(R.H.)*

Burayadək bəhs etdiyimiz məsələnin özəyi aşağıdakılardan ibarətdir: zəruri olan mərifət və iman, sadəcə olaraq, **ALLAH**ın qəlblərini nuruyla işıqlandırdığı vəlilərinə, dərin elm və təqva sahiblərinə nəsib olur. Onlar **ALLAH**dan gələn elmi qəbul edərək ona təslim olurlar.

Elm iki növdür:

Birincisi, **ALLAH**ın insanlara göndərdiyi şəriət elmi, onun əsası və təfərrüatlarıdır.

Digər elm isə, **ALLAH**ın qullarından gizli saxladığı qədər* elmidir. Kim Uca **ALLAH**ın göndərdiyi elmi (şəriəti) inkar edərsə, **ALLAH**ın qullarından gizlətmiş olduğunu da inkar etmiş sayılar.[74] Kim ki, qeyb elmini bildiyini iddia edərsə, küfrə batar. Çünki **ALLAH** qeyb elmini özünə məxsus etmişdir. Qeyb elmini bildiyini iddia etmək, həm də bu elmin **ALLAH**a xas olduğuna dair əsas iqtibasların* da inkar edilməsi sayılır.

Bir qulun iman əhli olub-olmamasına və yaxud onun imanının sabit (dəyişməz) qalmasına hökm vermək üçün o qulun göndərilən elmi qəbul etməsi və ondan gizlədilən elm haqqında iddialı olmaması lazımdır.

## Xülasə

Hər şey **ALLAH**ın qəza-qədəri ilə gerçəkləşir. **ALLAH** qullarının hansı əməlləri işlədəcəyini, onların Cənnət və yaxud Cəhənnəm sakini olacaqlarını bilir. **ALLAH** bunu Lövhi-məhfuzunda yazıb və istəyib. Qədər **ALLAH**ın gizli saxladığı bir

---

* ***Qədər –*** *qəzavü-qədər, tale, alın yazısı (F.S.).*

[74] *Türk dilinə (yəni,* ***«Kim ALLAHu Tealenin gönderdiqi ilmi (Şeriati) inkar ederse, ALLAHın kullarından gizlemiş olduğunu da inkar etmiş sayılır»*** *ifadəsinə) uyğun çevrilmiş bu sözləri əsərin ərəb orijinalı ilə:*

فمن أنكر العلم الموجود كفر لجحده بالنصوص الموجودة

*müqayisə etdikdə onlar arasında fərq aşkar edildi. Bu halda onları bir daha tərcümə etməyə səy göstərdik:* ***«Kim mövcud olan elmi qəbul etməzsə,*** *(Quran və Sünnədən olan – red.)* ***dəlilləri inkar etdiyi üçün küfr etmiş sayılar».*** *(R.H.)*

* *Qurandan iqtibas edilmiş ayələrin (F.S.).*

sirridir. Əməlisaleh insanlar qədəri dərindən araşdırmağa girişməzlər. Qədərə boyun əyməyən kimsənin imanı kamil olmaz.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Qədərə aid mübahisəyə yol vermək olarmı?
2. Elmin iki növü hansılardır?

# ON DÖRDÜNCÜ DƏRS

**47. Lövhə*, Qələmə və Lövhdə yazılan hər şeyə iman gətiririk. Uca ALLAHın orada olacağını yazdığı bir şeyin olmaması üçün bütün yaradılmışlar bir yerə toplaşsalar belə, buna gücləri çatmaz. Eynilə, Uca ALLAHın orada olmayacağı haqqında yazdığı şeylərin olması üçün hamı bir yerə yığışsa belə, buna gücləri çatmaz. (Çünki) Qələm Qiyamətə qədər baş verən şeyləri yazmış və artıq (mürəkkəbi) qurumuşdur.**[75]

## ŞƏRH

Qəti bir inam və təsdiqlə *"Lövh"-in gerçək olduğuna inanırıq.* Uca **ALLAH*: *** ***O, şanlı Qurandır. O, Lövhi-Məhfuzdadır*** ***(Buruc, 21-22),*** deyə buyurur.

"Lövhi-Məhfuz deyilən şey, **ALLAH**ın xəlq etdiklərinin qədərlərini** yazdığı lövhələrdir. **ALLAH** adı çəkilən Qələmlə yaratdıqlarının qədərlərini yazmışdır. Beləliklə, **ALLAH**ın Elçisi (s.ə.s.) belə buyurur:[76] *"**ALLAH**ın ilk yaratdığı Qələmdir. Ona: "Yaz!" demişdir. Qələm: "Nə yazım?" deyib. (**ALLAH**): "Qiyamət saatına qədər olacaq şeylərin qədərini yaz" deyə buyurmuşdur*".[77]

---

* *Burada: söhbət **Uca Allahın** bütün hökmlərinin yazıldığı "Lövhi məhfuzdan" gedir (F.S.).*

[75] *Türk tərcüməsində imam Təhavinin aşağıdakı sözləri buraxılmışdır:*

وما أخطأ العبد لم يكن ليصيبه ، وما أصابه لم يكن ليخطئه .

***«Qulun başına gəlməyəcək bir şey onun rastına çıxmayacaq. Onun rastına çıxacaq bir şey isə onun yaxasından əl çəkməyəcək»**. (R.H.)*

** *Qədər: tale (F.S.).*

[76] *Əbu Davud, 4700; ət-Tirmizi, Kitabul-Qadər, 2156; Kitabut-Təfsir, 3316, hədis səhihdir.*

[77] *Hədisin mətnini, sətiraltı qeyddə göstərilən mənbələrlə müqayisə etdikdə, onun, «Rəbbim» kəliməsinin ixtisar edilməsi istisna olmaqla Əbu Davuda məxsus olduğu aşkar edildi. Rəvayətin həmin hissəsinin tam ifadəsi aşağıdakı kimidir: «Qələm: "Rəbbim! Nə yazım?" deyib». Şeyx Əlbani rəvayətin səhih olduğunu bildirmişdir. (R.H.)*

Bu Lövhdə hər şey yazılmışdır. **ALLAH**ın Qədər Lövhündə olmasını istədiyi bir şeyin, xəlq edilənlərin hamısı birlikdə olmamasını diləsələr də buna nail ola bilməzlər. Bütün yaradılmışlar bir yerə yığışaraq nə qədər istəsələr də **ALLAH**ın istəmədiyi bir şeyin olmasına nail ola bilməzlər[*].

Qələm Qiyamətə qədər olacaq şeylərin hamısını yazmışdır. Qulun başına gəlməyəcək bir şey onun rastına çıxmayacaq. Onun rastına çıxacaq bir şey isə onun yaxasından əl çəkməyəcək. **ALLAH** nəyi istəsə, o da olacaq. **O**, nəyi istəməsə, o şey olmayacaq. Bunların hamısı **ALLAH**ın Elçisinin (s.ə.s.) bir hədisindən alınan mənalardır. **ALLAH**ın Elçisi (s.ə.s.) İbn Abbasa belə buyurur: "Bil ki: insanların hamısı, **ALLAH**ın sənin üçün təqdir etmədiyi bir şeyin sənə xeyir verməsinə çalışsalar da, buna nail ola bilməzlər. Onların hamısı yığışaraq sənə zərər vermək istəsələr, ancaq **ALLAH**ın sənin üçün yazdığı şey qədər zərər verə bilərlər. Artıq qələmlər götürülmüş və səhifələrin mürəkkəbi qurumuşdur[78].

**48. Beləliklə, qulun öhdəsinə düşən vəzifəsi, ALLAHın xəlq etdiklərinin hər biri haqqında elminin əzəli olduğunu dərk etməsidir. Qul bilməlidir ki, ALLAH bu elmini qəti və dəyişilməz bir şəkildə təsdiq etmişdir. Onun bu əzəli elminə uyğun təqdirini yaratdıqları arasından təxirə sala, aradan götürə, poza, nöqsanlı edə və artıra biləcək heç bir kəs yoxdur.[79] Beləcə, bunlar inanılması zəruri olan əsaslar, dinin təməlinin dərki və Uca ALLAHın**

---

[*] *Gücləri çatmaz (F.S.).*

[78] *ət-Tirmizi, Bab; Sifətul-Qiyamə, 2518, səhih hədisdir.*

[79] *Türk dilinə (yəni, **«Onun bu ezeli ilmine dayalı takdirini mahlukatından tehir edecek, gidirecek, bozacak, noksanlaştıracak ve fazlalaştıracak olan hiçbir kimse yoktur»**a) uyğun çevrilmiş bu cümlənin ərəb orijinalındakı ifadəsi və düzgün hesab etdiyimiz tərcüməsi aşağıdakı kimidir:*

ليس فيه ناقض ولا معقب ولا مزيل ولا مغير ولا ناقص ولا زائد من خلقه في سمواته وأرضه

***«(Onun bu əzəli elminə uyğun) təqdirini göylərdə və yerdə olan yaratdıqları arasından poza, təxirə sala, aradan götürə, dəyişə, nöqsanlı edə və artıra biləcək heç bir kəs yoxdur».*** *Tərcümələri müqayisə et. (R.H.)*

**təkliyinin və rübubiyyətinin etiraf edilməsinin çərçivəsində olan şeylərdir. Buna görə Uca ALLAH Kitabında:** ***…O, hər şeyi yaratmış və onu*** *[onun nə cür olacağını]* ***əvvəlcədən müəyyən etmişdir  (Furqan, 2) və  …ALLAHın əmri əzəli hökmdür!*** *[O mütləq yerinə yetirilməlidir!]* ***(Əhzab, 38)*** **deyə buyurur. Qədərlə bağlı ALLAHın əleyhinə çıxana və bu məsələyə xəstə qəlbinə əsaslanmış nəzər nöqtəsində dayanan kimsəyə təəssüflər olsun. Belə adam çəkdiyi faydasız əziyyəti ilə qeyb elminin araşdırılmasına aid olan qapalı sirrə üz tutmuşdur və bu barədə söylədikləri ilə günahkar yalançı kimi ad çıxarmışdır.**

## ŞƏRH

Qul bilməlidir ki, Uca **ALLAH**ın elmi yaratdığı hər şeydən əzəlidir. O, hər şeyi yaratmaqdan əvvəl bilir. Bu, həm böyük həcmli və həm də xırda şeyləri əhatə edən bir elmdir. Yaratdığı hər bir şeyi mütləq qədərlə xəlq etmişdir. Göylərdə, yerdə və onların arasında olanlardan bunları korlaya biləcək, ləngidəcək, əhəmiyyətsizləşdirəcək və yaxud dəyişdirəcək, azaldıb-artıra biləcək heç bir şey yoxdur. Uca **ALLAH** bütün kainatı yaratmamışdan əvvəl onun necə olacağını bilmiş və onun qədərini də müəyyənləşdirmişdir. Bu elm imanın vacib olan şərtlərindəndir və **ALLAH**ı tanıyıb, Onun Rububiyyətini təsdiq etmənin təməlidir. Əziz və cəlil olan **ALLAH** Kitabında belə buyurur:

 ***…O, hər şeyi yaratmış və onu*** *[onun nə cür olacağını]* ***əvvəlcədən müəyyən etmişdir  (Furqan, 2).***

 ***…ALLAHın əmri əzəli hökmdür!*** *[O mütləq yerinə yetirilməlidir!]* ***(Əhzab, 38).***

Uca **ALLAH** tərəfindən hər hansı bir şey necə vücuda gətiriləcəksə və o, necə yaradılacaqsa, öncədən Lövhi-Məhfuzda beləcə də yazılmış olur.[80] **ALLAH**ın qədərini və elmini yalana

---

[80] *Aşağıdakı cümlə türk tərcüməsində ixtisar edilmişdir:*

çıxaran kimsələr də orada qeyd olunmuşdur. Qədərə qərəzli nəzərlə baxaraq həqiqi və düzgün biliklərdən uzaqlaşana təəssüflər olsun! Çünki beləsi, qeybi araşdırmaq və **ALLAH**ın gizli saxladığı sirləri bilmək üçün boş yerə əziyyət çəkərək yolunu azmış xəstədir.[81] Bu şəxs qədər barədə nə qədər danışırsa danışsın, bu danışığıyla axırda yalan uydurmuşlardan olacaq və qədər həqiqətlərinə heç vaxt yetişməyəcək, qadağan edilmiş bir şeyi bilmək istəməsinə və araşdırılmasından çəkindirildiyi bir biliyi araşdırdığına görə böyük günah sahibi olacaqdır.

## Xülasə

Lövh haqdır. Qələm haqdır. Lövhdə yazılan bütün şeylər xəlq edilmişlər yaradılmamışdan qabaq yazılmışdır. O yazılar nə artır, nə azalır və nə də dəyişmir. Yaradılmışlar istəyir buna razı olsun və ya olmasın, istər bunu qəbul etsin və ya etməsin – Uca **ALLAH** nəyi istəsə, o da olar.

### Mövzunun aydınlaşdırılması üçün suallar

1. Lövh və Qələm haqqında nə bilirsiniz?
2. Xəlq olunmuşlar Uca **ALLAH**ın iradəsilə buyrulmuş bir şeyi dəyişdirə bilərmi?

---

وأراده وخلقه فعلا

*«O bunu felən istəmiş və yaratmışdır».* (R.H.)

[81] *Aşağıdakı cümlə türk tərcüməsində ixtisar edilmişdir:*

وكل من خاصم الله – تعالى – في قدره وكذب بشيء من ذلك ، فالويل له إذ أنكر علم الرب – تعالى – وقدرته ، وويل لمن نظر في القدر بقلب مريض ، فضلَّ عن معرفة الحق والصواب ، إذ اعتمد على الأوهام المريضة في فحص الغيب والتماس السر المكتوم الذي ستره الله – تعالى – عن جميع خلقه

***«Uca ALLAHın qədərində çəkişən və onu yalan sayan kimsələrin vay halına! O, uca Rəbbin elmini və qüdrətini inkar etmişdir. Qədərə xəstə (qərəzli) qəlblə baxaraq həqiqəti və düzgün nəzər nöqtəsini bilməkdən uzaqlaşan kimsənin də vay halına! Çünki beləsi, qeybi araşdırmaq və uca ALLAHın bütün yaratdıqlarından gizli saxladığı sirləri bilmək üçün sağlam olmayan bir ehtimallara əsaslanmışdır».*** *(R.H.)*

# ON BEŞİNCİ DƏRS

**49. Ərş və kürsü haqdır.**

**50. ALLAHın ərşə və yaratdığı digər şeylərə ehtiyacı yoxdur.**

**51. ALLAH hər şeyi əhatə edəndir və hər şeyin fövqündədir. Yaratdıqları isə Onu əhatə etməyə acizdirlər.**

## ŞƏRH

Uca **ALLAHın** ərşi haqdır. Buna şübhə yoxdur. Uca **ALLAH** ərş barədə bir çox ayələrində biliklər vermişdir: ***"Şanlı ərşin sahibi də yenə Odur!" (Buruc, 15).***

Ərş **Allahın** yaratdığı şeylərin ən əzəmətlisidir.[82] Onu əzəmətli mələklər daşıyırlar. Ərş Firdovs Cənnətinin tavanıdır. Bu və buna bənzər xəbərlər **ALLAHın** Elçisi (s.ə.s.) tərəfindən rəvayət edilmişdir. **ALLAHın** Elçisindən (s.ə.s.) gələn xəbərlərdə ərşin ayaqlarından bəhs edilir. Bu xəbərlər, ərşin "mülk" (mülkiyyət) olması yönündə verilən şərhləri rədd edir.

Kürsü də haqdır. O, iki ayağın qoyulduğu yerdir. Onu **ALLAHdan** başqa bir kimsə öz təfəkkürü ilə dərk edə bilməz.[83] **ALLAH** kürsünün sahəsini bütün göylərə və yerə yaymışdır. ***"Onun kürsüsü** [elmi, qüdrət və səltənəti] **göyləri və yeri əhatə etmişdir" (Bəqərə, 255).*** Bu şərəfli ayə kürsünün elm mənasında yozulması rəyini rədd edir.

---

[82] *Aşağıdakı sözlər türk tərcüməçisi tərəfindən ixtisar edilmişdir:*

لا يحيط به إلا الله تبارك و تعالى

***«Uca ALLAHdan başqa heç kim ərşi əhatəyə ala bilməz».** (R.H.)*

[83] *Türk dilinə (yəni, **«Onu Allahtan qayri kimse ilmiyle kuşatamaz»**a) uyğun çevrilmiş bu cümlə, əsərin orijinalında aşağıdakı kimidir:*

ولا يحيط به إلا الله – تعالى –

*yəni, **«Onu ALLAHdan başqa bir kimsə əhatə edə bilməz»**. Tərcümələri müqayisə et. (R.H.)*

**ALLAH** nə ərşə, nə də kürsüyə möhtac deyil. Onlara ehtiyacı yoxdur. **ALLAH** ərşə ehtiyacı olduğuna görə onun üzərinə yüksəlməmişdir. Əksinə, ən ali bir hikmətlə bağlı bunu belə istəmişdir. **ALLAH** ərşə və başqa şeylərə möhtac olmaqdan uzaqdır. **ALLAH**ın izzəti və uluhiyyəti ərşdən və kürsüdən çox ucadır. Ərş də kürsü də **ALLAH**ın qüdrəti və hökmü ilə daşınır.

Uca **ALLAH** yaratdıqlarını elmi və qüdrəti ilə əhatə etmişdir.[84] Ərşin fövqündə **ALLAH**dan başqa kimsə yoxdur. **ALLAH** bütün yaratdıqlarını nəzərə alan elm, güc və zəfərlə əhatə etmişdir. **ALLAH**ın xəlq etdiklərindən heç biri Onu əhatə edə bilməz.

***"[Rəbbin] onların keçmişini də, gələcəyini də bilir. Onların elmi isə Onu [ALLAHın zatını] əhatə edib qavraya bilməz" (Taha, 110).***[85]

## Xülasə

Ərş və kürsü haqdır. **ALLAH**ın onlara ehtiyacı yoxdur. **ALLAH** hər şeyi əhatə etmişdir. Kimsə Onu əhatə edə bilməz.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Uca **ALLAH** nəyin üzərinə yüksəlmişdir?
2. Ərş və kürsü haqqında nə bilirsiniz?



---

[84] *Türk dilinə (yəni,* ***«Allahu Teala, yaratmış olduklarını ilmi ve küdretiyle kuşatmıştır»****a) uyğun çevrilmiş bu cümlə əsərin ərəb orijinalında aşağıdakı kimidir:*

وهو – سبحانه وتعالى – محيط بكل شيء من المخلوقات ، العرش وما دونه

*«Pak və uca* ***ALLAH*** *bütün yaratdıqlarını, o cümlədən ərşi və qeyrilərini əhatə etmişdir». (R.H.)*

[85] *Türk tərcüməsində aşağıdakı cümlə buraxılmışdır:*

فسبحان ذي العزة والجلال والملكوت!

***«Pak olan ALLAH izzət, cəlal və mülkiyyət sahibidir».*** *(R.H.)*

# ON ALTINCI DƏRS

**52. Biz deyirik ki, həqiqətən ALLAH İbrahimi (ə.) Özünə dost etmiş, Musa (ə.) ilə (özünəməxsus bir tərzdə) danışmışdır. Buna iman gətirir, təsdiq edir və təslim oluruq.**

**53. Mələklərə, peyğəmbərlərə və elçilərə vəhy edilmiş Kitablara iman gətiririk. Onların açıq-aydın Haqq uzərində olduğuna da şahidlik edirik.**

## ŞƏRH

**ALLAH,** Kitabında buyurduğu kimi, İbrahim əleyhissəlamı Özünə dost tutmuşdur.

***□ …Həqiqətən, ALLAH İbrahimi Özünə dost tutmuşdur □ (Nisa, 125).***

Onu **Özünə** yaxınlaşdırdı, insanların arasından seçib ucaltdı və Onu Məhəmməddən (s.ə.s.) başqa kimsənin yetişmədiyi bir məqama çatdırdı.[86]

***□ …ALLAH Musa ilə sözlə [**arada heç bir vasitə olmadan**] danışdı □ (Nisa, 164).***

Uca **ALLAH** Musa əleyhissəlam ilə həqiqətən danışdığını sübut və təsdiq etmək üçün "kəlimə" felinin məsdəri olan "təkəllum"[*] zaman formasını[**] işlətmişdir ki, bu da danışığın gerçək olduğuna sübutdur. Bəzi zəlalət sakinləri **ALLAH**ın Musa əleyhissəlam ilə danışmadığını söyləyərək, **ALLAH**ın kəlam sifətini

---

[86] *Türk tərcüməsində aşağıdakı sözlər buraxılmışdır:*

كما أنه – سبحانه وتعالى – كلم موسى عليه السلام تكليمًا كما قال ...

***«Həmçinin pak və uca ALLAH Musa əleyhissəlamla sözlə danışdı. O belə buyurur...».*** *(R.H.)*

[*] ***Təkəllum*** *– danışma, söyləmə (F.S.).*

[**] *Əsərin türk mətnində "siğə" sözü işlədilmişdir ki, bu da ərəb dili qrammatikasında zamanlara görə dəyişən felin formalarındandır (F.S.).*

qəbul etmirlər. **ALLAH**ın bilavasitə danışması Onun Öz ali zatına məxsus səs və hərflərlədir. Bu barədə şəriət dəlillərində nəql edilənlərə iman gətiririk. Bunu inkar edib, yox saymarıq.

Xeyrin və şərin də **ALLAH** tərəfindən yaradıldığına iman gətiririk.[87]

Mələklərin **ALLAH**ın nurdan yaratdığı qulları olduğuna iman gətiririk. Onlar yaradılmış yüksək xilqətlərdir.

** …ALLAHın onlara verdiyi əmrlərə asi olmayan, buyurulduqlarını yerinə yetirən daş qəlbli [*heç kəsə zərrəcə rəhm etməyən*] və çox sərt təbiətli mələklərdir…  (Təhrim, 6).**

** Göyləri və yeri yoxdan yaradan, ikiqanadlı, üçqanadlı və dördqanadlı mələkləri [*peyğəmbərlərə*] elçi edən ALLAHa həmd olsun!  (Fatir, 1).**

Vəhylərdə gəldiyi kimi mələklərə iman gətiririk. Cəbrailə, Mikailə, İsrafilə, Ölüm mələyinə, Cənnət və Cəhənnəm mələklərinə, İnkir və Münkirə, Raqib, Atid (deyilən hər bir sözü yazmaq üçün hazır durub gözləyən iki mələyə – red.) və eləcə də Mühafizə mələklərinə iman gətiririk.

**ALLAH**ın insanlar arasından seçib Öz vəhyi və şəriəti ilə şərəfləndirdiyi elçilərinə də iman gətiririk. O elçilər azad və **ALLAH**ın kişi cinsindən olan qullarındandır.

---

[87] *Türk dilinə (yəni,* ***«Bunu inkar edip yok saymayız. Hayra, şerre ve bunun da Allah tarafından yaratıldığına iman ederiz. Meleklerin, Allahın nurani kulları olduğuna iman ederiz. Onlar yüce yaratıklardır»****a) uyğun çevrilmiş bu cümlələri əsərin ərəb orijinalı ilə:*

فلا ننفيه ولا نؤوله ، إيمانًا بالخبر وتصديقًا ، وتسليمًا لمراد الله – تعالى – ومراد رسوله ، صلى الله عليه وسلم . نؤمن بالملائكة وهم مخلوقات نورانية عظيمة .

*müqayisə etdikdə onlar arasında fərq aşkar edildi. Beləki,* ***«Xeyrin və şərin də ALLAH tərəfindən yaradıldığına iman gətiririk»*** *sözləri əsli nüsxəyə əlavə edilmiş,* ***«Verilən xəbərə iman gətirib təsdiqləyərək, uca ALLAHın iradəsinə və Onun Elçisinin (s.ə.s.) istəyinə təslim oluruq»*** *cümləsi isə oradan çıxarılmışdı. Bu səbəbdən orijinal mətnin yenidən tərcümə edilməsinə səy göstərdik:* ***«Bunu nə inkar, nə də təhrif etmirik. Verilən xəbərə iman gətirib təsdiqləyərək, uca ALLAHın iradəsinə və Onun Elçisinin (s.ə.s.) istəyinə təslim oluruq. Mələklərin olduğuna iman gətiririk. Onlar nurdan yaradılmış əzəmətli xilqətlərdir.».*** *(R.H.)*

***Biz peyğəmbərlər göndərdik. Onların bəzisinin əhvalatını bundan əvvəl sənə danışdıq, bəzisinin əhvalatını isə söyləmədik…* *(Nisa, 164).***

**ALLAH**ın endirdiyi Kitabların hamısına, **ALLAH**ın bizə bildirdiyi kimi, Tövrata, Zəbura, İncilə, Qurana və İbrahim əleyhissəlamın səhifələrinə iman gətiririk. Quranda buna işarə edilmişdir:

***Həqiqətən, bu deyilənlər** [Qurandan] **əvvəlki kitablarda mövcuddur – İbrahimin və Musanın kitablarında! (Əla, 18-19).***

***…Bundan əvvəl insanları doğru yola yönəltmək üçün Tövratı və İncili də** [səmadan] **O endirdi.** [Haqqı nahaqdan ayırd edən] **Furqanı** [Quranı] **da O nazil etdi… (Ali-İmran, 3-4).***

***…Biz Davuda da Zəburu verdik (Nisa, 163).***

Biz bu Kitabların hamısına iman gətiririk. Vəhylərdə təfərrüatı ilə bildirilməyənlərə də olduğu kimi iman gətiririk. Çünki bu, Qurani-kərimdə xülasə halında verilmişdir. Bütün elçilərin aydın bir *haqq din* və *doğru şəriətlə* göndərildiyinə inanırıq. Onlar insanları doğru şəriətə çağırırdılar: ***…Onların heç birini digərindən ayırmırıq. Biz ancaq ALLAHa boyun əyən müsəlmanlarıq! (Bəqərə, 136)***.

## Xülasə

**ALLAH**ın "dostluq" və "danışma" sifətləri həqiqətən sübuta yetmişdir. Biz buna iman gətiririk. Ehtiram sahibi mələkləri, bütün peyğəmbərləri və onlara endirilmiş Kitabları təsdiqləyirik. Bunların hamısı insanlara doğru yol göstərmək üçün **ALLAH** tərəfindən göndərilmişlər.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. **ALLAH**ın dostu kimdir?
2. **ALLAH** kiminlə bilavasitə Öz sözü ilə danışmışdır?
3. Mələkləri, peyğəmbərləri və Kitabları inkar edənlər haqqında hansı hökmlər verilmişdir?

4. **ALLAH**ın göndərdiyi Kitablar hansılardır?[88]



[88] *Türk mətninə (**«Allahın gönderdiyi Kitaplar hanqileridir»** cümləsinə) uyğun çevrilmiş dördüncü sual, əsərin müqayisə apardığımız ərəb nüsxəsinə (yəni, ər-Riyad şəhəri, Dərul-Vətən nəşriyyatı, 1414 h. ili, 1-ci nəşrinə) əlavədir. (R.H.)*

## ON YEDDİNCİ DƏRS

**54. Biz qibləmizə üz tutan insanları, Peyğəmbərə** (s.ə.s.) **nazil edilmişləri etiraf etdikləri, Onun söylədikləri və xəbər verdikləri hər bir şeyi təsdiq etdikləri halda, müsəlman və mömin adlandırırıq.**

## ŞƏRH

Deyilənlərdən məqsəd budur: Kim İslama gələrsə, qibləmizə yönələrək namaz qılarsa, dində bilməsi zəruri olan haramı halal və halalı da haram saymazsa, **ALLAH** Elçisinə (s.ə.s.) vəhylə nazil edilənləri, verilən əqidəni, şəriəti və hökmləri qəbul edərsə, o şəxs müsəlmandır.

Ona mömin və müsəlman deyərik. **Onu, *dində haram olan bir günahı halal sayıb İslam qaydalarını pozan bir şeyi qəsdən və bilərəkdən etmədikcə,* heç vəchlə kafir adlandırmarıq*.**

Təhavinin bu ifadəsindən məlum olduğu kimi, o, iman və İslamı eyni mənada görür.[89] Bu iki anlayışın hər biri ayrılıqda götürüldükdə, onlardan biri nəyə işarə edirsə, digəri də onu təkrarlayır. Əgər bu iki istilah – iman və İslam eyni yerdə birgə işlədilirsə, İslam zahiri əməllərə, iman isə qəlblə bağlı əməllərə dəlalət edir. **ALLAH** daha yaxşısını bilir.

---

* ***Kursiv*** *və* ***fərqləndirmə*** *bizimdir (F.S.).*

[89] *Aşağıdakı cümlə türk tərcüməsində ixtisar edilmişdir:*

وقيل بأنهما متغاير ان

***«Bir başqaları isə, onların bir-birindən fərqləndiyini söyləmişlər».*** *(R.H.)*

## Xülasə

Hər kəs **ALLAH**ın Peyğəmbərinə (s.ə.s.) nazil olanlara iman gətirərsə və təslim olarsa, onun müsəlmanlığına şahidlik edirik.[90]

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Kimə müsəlman deyə bilərik?

2. İslamla imanın fərqi varmı? Varsa, bu fərqlər nədən ibarətdir?[91]



---

[90] *Türk mətninə (**«Her kim Rasulullahın getirdigine iman eder ve teslim olursa, onun müslümanlığına şehadet ederiz»**) uyğun olan bu cümlə, ərəb orijinalından:*

كل من أقر بما جاء به الرسول ، صلى الله عليه وسلم ، وانقاد له ، واستقبل القبلة ، وصدق بخبره ، شهدنا له بالإسلام .

*müxtəsər olaraq çevrilmişdir. Onun tam tərcüməsi aşağıdakı kimidir: **«Hər kəs ALLAHın Elçisinə (s.ə.s.) nazil olanlara iman gətirərsə, Ona (s.ə.s.) itaət edərsə, qibləyə yönələrsə və Peygəmbərin (s.ə.s.) xəbər verdiklərini təsdiq edərsə, onun müsəlmanlığına şahidlik edirik».** (R.H.)*

[91] *Türk mətninə (**«Allahın gönderdiyi Kitaplar hanqileridir»**) uyğun çevrilmiş dördüncü sual, əsərin müqayisə apardığımız ərəb nüsxəsinə (yəni, ər-Riyad şəhəri, Dərul-Vətən nəşriyyatı, 1414 h. ili, 1-ci çapa) əlavədir. (R.H.)*

# ON SƏKKİZİNCİ DƏRS

**55. Nə ALLAHın zatı haqqında mübahisə edir və nə də Onun dini ilə bağlı mübahisələrə giririk.**

**56. Qurana aid mübahisələrə girmir, onun aləmlərin Rəbbinin kəlamı olduğuna şahidlik edirik. Onu Ruhuləmin[*] endirmiş və elçilərin ağası Məhəmmədə** (s.ə.s.) **öyrətmişdir. O, Uca ALLAHın kəlamıdır, yaratdıqlarının heç birinin sözü ona bərabər ola bilməz. Onun məhluq (xəlq edilmiş) olduğunu deməyir, müsəlman camaata müxalif olmayırıq.**

## ŞƏRH

**ALLAH**ın zatı[**] haqqında heç vaxt mübahisə etməyirik. Bu, xəlq edilmiş insanın əsla bilə bilməyəcəyi qeybi məsələdir. Bilavasitə etməli olduğumuz şey – bu mövzuda danışmamaqdır. Biz ancaq **Allahı Özünə** verdiyi adlar və sifətlərlə tanıyır və tanıdırıq. Bu məsələdə bizə çatan səhih xəbərlərdən kənara çıxmırıq. Əziz və cəlil olan **ALLAH**ın dinində öyünərək təkəbbürlük göstərməyir və çəkişmə salmayırıq. Haqq əhli olanlara heç vaxt şübhələndiyimizə görə iftira atmayırıq. Çünki bu, həm saxtakarlıq və həm də fitnəkarlıqdır.

Müqəddəs Quran haqqında öz görüşlərimizlə mübahisə etməyirik. Onun barəsində zəlalət əhlinin etdiyi kimi çəkişməyirik. Əksinə, Rəbbinizin onu Cəbrail vasitəsilə Peyğəmbərə (s.ə.s.) nazil etdiyi şəkildə qəbul edib iman gətiririk:

 ***Şübhəsiz ki, bu [***_Quran_***] aləmlərin Rəbbi tərəfindən nazil edilmişdir! Onu Cəbrail [***_Ruhuləmin_***] endirdi: [***_Günahkarları_ ***ALLAH***_ın əzabı ilə_***] qorxudan peyğəmbərlərdən olasan deyə, sənin***

---

[*] ***Ruhuləmin –*** *Cəbrail əleyhissəlam (F.S.).*

[**] *Özlüyü (F.S.).*

***qəlbinə nazil etdi; Özü də açıq-aydın ərəb dilində  (Şuəra, 192-195).***

Quranın həqiqətən **ALLAH**ın Kəlamı olduğuna iman gətirib onu qəbul edirik. Heç bir söz ona nə bənzərdir və nə də buna yaxındır. O, qulların kəlamına bənzəməz.

Cəhmiyyəçilərin[*] iddia etdiyi kimi, "Quran yaradılmışdır" demirik. Bu həddi aşmağa cəhd etmirik. Bizdən əvvəlki səhabə, tabein və onlara səmimiyyətlə qoşulan müsəlman camaatının Qiyamətə qədər iman gətirdiyinə inanırıq. Bu barədə kim onlara qarşı çıxırsa, o, açıq-aydın yolundan azmışdır.

## Xülasə

**ALLAH**ın zatı və dini ilə bağlı mübahisə açmaq caiz deyildir. Qurana dair mübahisələr açmaq qəbul olunmur. Quran **ALLAH**ın Kəlamıdır, kimsə tərəfindən yaradılmamışdır. Bundan başqa, müsəlman əhlinə qarşı müxalifətdə olmaq da qəbul olunmazdır.

---

[*] ***Cəhmiyyə*** *– yolundan azmış təriqətlərdəndir. Bu təriqətə Cəhm b. Safvana görə belə bir ad verilmişdir. Cəhm, Səd b. Dirhəmin tələbəsi olmuşdur. Sədi isə, zındıqlıq iddiasına düşdüyünə görə Xalid əl-Quşeyri tərəfindən 124-cü ildə öldürmüşdür. Səd də elmini Əbən Ləbib b. Asamdan almışdır. Ləbib isə Peyğəmbər cənablarına (s.ə.s.) cadu etmiş yəhudidir. Cəhmin iddiaları beləydi: "****ALLAH**** İbrahimi xəlil etməmişdi. Musa ilə danışmamışdı. Quran yaradılmışdır. Cənnət və Cəhənnəm əbədi deyildir. Məhv olurlar. İman, sadəcə olaraq mərifətdir (bilməkdir). Küfr isə bilməməkdir. İnsanların həqiqi əməlləri yoxdur, insan əməlləri məcazidir". Bundan başqa o,* ***ALLAH****ın bütün əzəli sifətlərini də inkar edirdi. Cəhm b. Safvan Əməvilərin son dövründə, hicri 128-ci ildə Sələm b. Əhvaz əl-Məzini tərəfindən öldürülmüşdür (Əhməd b. Hənbəl, ər-Rəddu alə əz-Zənədiqa vəl-Cəhmiyyə, səh. 23; Kitabus-Sunnə, səh. 81; İmam Bağdadi, Fərq beynəl-firaq, səh. 211; İmam Əşari, Məqalətul-İslamiyyin, c. 1, səh.338; İmam Zəhəbi, Mizanul-itidal, c. 1, səh. 426; İmam Təbəri, CX 7, səh. 330; Şəhristani, əl-Miləl vən-Nihəl, c.1, səh. 86).*

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. **ALLAH**ın zatı haqqında mübahisə etmənin hökmü nədir?
2. Quran barədə mübahisə etmək caizdirmi?
3. Müsəlman camaat kimdir?



# ON DOQQUZUNCU DƏRS

**57. Qiblə əhlindən olan müsəlmana etdiyi günahlara görə, etdiklərini halal sanmadığı müddət ərzində kafir (təkfir) hökmü vermirik.**

**58. İmanı olan və həm də gunah işlədənə günahı zərər verməz də demirik.**

**59. Xeyir işlər sahibi olan möminləri ALLAHın bağışlayaraq Cənnətə göndərəcəyinə ümid edirik. Bununla belə onların haqqında (əzab görməyəcəklərinə) əmin deyilik. Onların Cənnətlik olacaqlarına da şahidlik etmərik. Günahkar olanların bağışlanmasını diləyər, onların aqibətindən qorxar, lakin ümidlərini qırmarıq.**

## ŞƏRH

Əhli Sünnə vəlcamaat hər hansı bir musəlmana, kiçik və ya böyüklüyündən asılı olmayaraq haramı halal hesab etmədikcə, kafir hökmü verməz. Lakin haramı qəlbən halal qəbul edərək, onun haram olmadığına inanarsa, **ALLAH**ın haram etdiyini halal saydığına görə ona kafir hökmü verilir. Haram əməl görmək hələ onu qəbul etmək deyildir. Xaricilər[92] isə müsəlmanı işlətdiyi günahdan ötrü kafir sayırdılar.

---

[92] *Müsəlman bir imama qarşı çıxan hər kəsə "xarici" deyilmişdir. İstər səhabələr dövründə, istərsə də sonrakı dövrlərdə bu belə olmuşdur. "Xarici" ilk dəfə həzrəti Əliyə qarşı çıxanlara verilmiş addır. Əslində onlar həzrəti Əlinin camaatından idilər. Müaviyə ilə həzrəti Əli (Allah ondan razı olsun) arasındakı "hökm etmə" hadisəsində həzrəti Əliyə qarşı çıxmışlar. Həzrəti Əli (Allah ondan razı olsun) onları başa salmağa çalışdısa da, onlar razı qalmadılar və "hökm etmə" məsələsini küfr kimi qəbul edərək Əlidən (Allah ondan razı olsun) ayrıldılar. Həzrəti Əli (Allah ondan razı olsun) İbn Abbası onların yanına göndərdi. İbn Abbas onların bir hissəsini başa saldı, digər hissəsi isə öz cəhalətləri üzündən razı qalmadılar. Həzrəti Əli (Allah*

Əhli Sünnə vəlcamaat "İmanla bərabər günah zərər verməz" deməzlər. Çünki bu, Mürciənin baxışıdır. Onun sonu isə, günahkarlar haqqında nazil olan (Cəhənnəmlə – red.) qorxutma ayələrinin yalana çıxarılmasına gətirir. Mürciyə[93] belə düşünür. Lakin günah imanı əksildir. Biz bu günahları edən şəxslərin imanının zəifləməsindən və onların **ALLAH**ın əzabına layiq olacaqlarından qorxuruq.

Əhli Sünnə vəlcamaat xeyir əməllər sahibi olan möminlərin Cənnətə düşəcəyinə ümid bəsləyir. Bu tərzdə ölənləri müjdələyirik. Lakin buna baxmayaraq belələrinin **ALLAH** tərəfindən imtahana çəkilməyəcəyini deyə bilmərik. Eyni zamanda, onların mütləq Cənnətdə olacağına da söz verə bilmərik. Günahkar insan üçün tövbə və bağışlanma olur. Onun mütləq

---

*ondan razı olsun) onlara qarşı vuruşdu və onları öldürdü. Onların əqidələri beləydi:*

*1. Əli (Allah ondan razı olsun) hökm etmək məsələsində yanlışlığa yol vermiş və kafir olmuşdur; 2. Şəriət hökmlərini təfsilatı ilə bilməyənlər kafirdir; 3. İman və küfrdə kiçik uşaqlar da ataları kimidirlər (Yəni atası kafir olan uşaq da kafirdir (F.S.)); 4. Böyük günah edənlər kafirdir; 5. Onların (xaricilərin (F.S.) əleyhinə gedənlər böyük günah etmişlər; 6. Zalım hökmdara qarşı susanlar kafirdilər; 7.* ***ALLAH*** *xeyri arzu edər, şəri arzu etməz (İbn Həzm, əl-Miləl vən-Nihəl, c. 4, səh. 168; Şəhristani, əl-Miləl vən-Nihəl, c. 2, səh. 115; Əhli Sünnə camaatının etiqadi özəllikləri).*

[93] *İmam Əhməd b. Hənbəl Mürciyə haqda belə deyir: "Mürciəçilər belə iddia edirdilər: "İman sadəcə sözdür, əməl imana daxil deyildir. İnsan sadəcə olaraq diliylə "iman gətirdim" desə, bəsdir. İnsanların imanları arasında fərq yoxdur. Mələklərin, peyğəmbərlərin, səhabələrin və digər insanların imanları birdir, bir-birilərindən fərqlənmir. İman əksilməz, artmaz. Kim ki, qəlbən iman gətirib bunu diliylə də təsdiq etsə, lakin ona əməl etməsə, bu həqiqi imandır" (İmam Əhməd, Kitabus-Sunnə, səh. 80-81; İmam Xalləl, Kitabus-Sünnə, səh. 93).*

*Mürciə xaricilərin fəaliyyətinə cavab (reaksiya) olaraq "iman-küfr" məsələsinə görə ortaya çıxmışdır. Mürciənin bidəti ilk dəfə üzə çıxarkən sözlə aparılırdı. Amma daha sonralar fəlsəfi təhlillərlə dərinləşərək yoldan çıxmışdır.*

*(Mürciyə haqqında ətraflı məlumat almaq üçün "Quraba" nəşriyyatının "Əhli Sünnə camaatının etiqadi özəllikləri" adlı kitabın 206-209-cu səhifələrinə baxın).*

Cəhənnəmlik olacağını da deyə bilmərik. Çünki bu, **ALLAH**ın mərhəmətindən ümidi üzmək olardı.

Əhli Sünnə vəl camaat, Quran və Sünnənin bəyan etdiyindən başqa heç kim üçün "Cənnət əhlidir" deməz. Heç kimin haqqında da Quran və Sünnədən barəsində aydın hökmlər olmasa, ona "Cəhənnəmlikdir" demərik.[94]

**60. Hər xeyirxah əməlinin qəbul edilərək Cənnətə düşəcəyinə əmin olmaq və ALLAHın mərhəmətindən tamamilə ümidini kəsmək insanı dindən çıxarar. Buna nisbətən qiblə əhli üçün haqq yol qorxu və ümid arasındadır.**

**61. Qul onu imana (İslama) daxil edən bir şeyi inkar etmədikcə imandan (İslamdan) çıxmaz.**

**62. İman – onu dil ilə iqrar və qəlblə təsdiq etməkdeməkdir.**

## ŞƏRH

**ALLAH**ın imtahanından çıxacağına və cəzalandırılmayacağına əmin olmaq və **ALLAH**ın mərhəmətindən ümidini kəsmək insanı İslamdan çıxarar. Uca **ALLAH** Kitabında belə buyurur:

***□ Allahın mərhəmətindən ümidinizi kəsməyin. Allahın mərhəmətindən yalnız kafirlər ümidini üzər □ (Yusif, 87).***

***□ …Allahın bu yolla dolaşdırıb bəla toruna salmayacağına özlərinə zərər eləyənlərdən başqa heç kəs arxayın ola bilməz! □ (Əraf, 99).***

Haqq əhlinin yolu bu ikisinin arasında orta bir yol tutmaqdır. Qulun yerinə yetirməsi zəruri olan şey **ALLAH**ın

---

[94] *Aşağıdakı cümlə türk tərcüməsində ixtisar edilmişdir:*

أما غير هذا فلا جزم ولا قطع للمسلم بشيء .

***«Bundan başqasına gəlincə, müsəlmana bu barədə qəti hökm vermək olmaz»**.(R.H.)*

əzabından qorxma ilə Onun mərhəmətinə ümid bəsləmə arasında olmaqdır.

"Mömini imanından imanını pozan bir şey çıxarmış olur. Məsələn, imana aid olan bir şeyi inkar etmək, o olmadan imanın gerçəkləşə bilməyəcəyi bir şeyi qəbul etməmək kimi. Bunlar insanın ilk qərarını ləğv edir. Beləliklə də "böyük günah işlədən kafir olar" deyən xaricilərlə, "imandan iki mənzil arasına keçməkdən" söz salan mötəzililərə bir cavab var. Bunun əksinə olaraq, günahkar müsəlman günahını tövbə edincəyə qədər günahkardır. O, inkar etdiyi qədər imanına zərər verir. O, tam mənada, imanın əsasını inkar etmədikcə, "mömin" adını daşıyar. İmanın bəzi hallarının pozulmasıyla hamısı pozulmaz. Çünki iman şöbələrdən ibarətdir.

Təhavinin "iman – onu dillə iqrar və qəlblə təsdiq etməkdir" nəzəriyyəsi düzgün deyildir. Əhli Sünnə və camaatın tutduğu doğru yol və alimlərin əksəriyyətinin baxışları "iman – qəlblə təsdiq, dillə iqrar və əməllərlə yerinə yetirilən" şəklindədir. Bu, əhli Sünnə və camaatın metodudur. Əməlin imandan olmasına dair Quran və Sünnədə bir çox dəlillər vardır. Buna görə, Sünnə əhlinin baxışları imanın əməllə artıb-əskiləcəyi qənaətindədir. İman itaətlə artar, günahlarla əksilər. Uca **ALLAH** Quranda belə buyurur:

 ***…Möminlərə gəlincə,** [hər bir surə] **onların imanını artırar və onlar** [bu surələrin nazil olmasına] **sevinərlər  (Tövbə, 124).***

 ***Möminlərin imanı üstünə iman artırmaq üçün onların ürəklərinə Öz dərgahından xatircəmlik, rahatlıq və mənəvi möhkəmlik göndərən Odur…  (Fəth, 4).***

 ***ALLAH doğru yolda olanların doğruluğunu artırar…  (Məryəm, 76).***

Əgər əməllər imanın müəyyən edilməsi üçün zəruri olmasaydı, o zaman təqva sahibi ilə əxlaqsız, itaətkarla günahkar şəxslərin hamısı, **ALLAH**ın varlığını qəbul etdikləri təqdirdə, imanda bərabər hesab edilməliydilər. Amma bu fəsadlı metod-

dur. Doğrusu isə, bizim açıqladığımız əhli Sünnə vəlcamatın baxışlarıdır.

## Xülasə

Qiblə əhlindən olan bir müsəlmanı işlətdiyi günahı halal qəbul etmədikcə kafir saymayın. Günahkar insanın imanı günahına görə zəiflər və günahı üçün **ALLAH**ın əzabını qazanar. Heç bir müsəlman üçün barəsində sübut olmazsa, o, cənnətlikdir və ya cəhənnəmlikdir deməyik. **ALLAH**ın əzabına əmin olmaq və mərhəmətindən ümidini kəsmək insanı dindən çıxardar. Həqiqət qorxu ilə ümid arasında olmaqdadır. İman, əhli Sünnəyə görə, qəlbin təsdiqi, dilin iqrarı və bədən üzvlərinin hərəkəti ilə yaranır.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Mömini günahına görə kafir saymaq üçün hansı hökmlər var?
2. İnsanın işlətdiyi günah imanına zərər verirmi?
3. Kim üçünsə, o, cənnətlikdir və ya cəhənnəmlikdir deyə bilərmiyik?
4. Müsəlman imanını nə zaman itirir?
5. Əhli Sünnənin baxışlarına görə iman nədir?



# İYİRMİNCİ DƏRS

**63. ALLAH Elçisindən** (s.ə.s.) **bizə səhih rəvayətlə gəlib çatan şəriət və açıqlamaların hamısı həqiqətdir.**

**64. İman vahiddir. İman əhli onun əsası baxımından bərabərdirlər. Onların arasındakı fərqlər ALLAHdan qorxmaları, təqvalı olmaları, istəklərinin əksinə olaraq doğru olanı qəbul etmələrindən ötrüdür.**

**65. Möminlərin hamısı ALLAHın dostu olan qullarındandırlar (övliyaur-Rəhmandırlar). ALLAH dərgahında onların ən şərəfliləri ALLAHa ən çox itaət və Qurana əməl edənlərdir.**

## ŞƏRH

**ALLAH**ın Elçisindən (s.ə.s.) şəriət və din məsələləri ilə bağlı dəqiq yollarla gələn açıqlamaların hamısı həqiqətdir. Bu bizə, mütəvatir və yaxud da əhəd[95] nəql yolu ilə gəlmiş olsun, fərqi yoxdur, əhəmiyyəti birdir. Bu, haqq əhlinin məsləkidir. **ALLAH**ın Peyğəmbəri (s.ə.s.) uydurma hədisləri Ona aid edən hər bir kəsi **ALLAH** yanında rüsvay etmiş, Cəhənnəmdə yerinin hazırlanmasını bildirmişdir.

Bu ifadəmiz Təhavinin daha əvvəlcə imanın müəyyən olunmasını göstərdiyi əsaslara istinad edir. Doğrudan da, insanlar iman məsələlərində dərəcələrə bölünürlər. Əks halda: "Bizim

---

[95] *"Mütəvatir" sözü dilçilikdə ardıcıl, "əhəd" isə tək, vahid mənalarını bildirir. Hədis alimləri, "Hədis üsulu" elminə məxsus bir termin kimi çoxsaylı isnadlarla rəvayət olunan hədislərə "mütəvatir", azsaylı isnadlarla nəql edilənlərə isə, "əhəd" deyirlər. Hədisçilər "əhəd" rəvayətləri üç hissəyə bölürlər: 1) Məhşur, üç və ya daha çox isnadı olan, 2) Əziz, iki isnadı olan, 3)Qərib, bir isnadı olan hədislərdir. Bu qeyddən sonra, sözün şərti mənalarına əhəmiyyət verməyən və yalnız müxtəsər lüğət kitabları ilə kifayətlənən mütərcimlərin öz tərcümələrində daha diqqətli olacaqlarına ümid edirik. (R.H.)*

imanımız da **ALLAH**ın Peyğəmbərinin (s.ə.s.) imanı kimidir", ya da, "bizim imanımız da mələklərin imanı kimidir" deyə bilərdik. Bu isə açıq-aydın batil fikirdir. Əməllər imana bağlıdır. Baxmayaraq ki, bunda insanlar bir-birilərindən fərqli olsalar da. Hətta hər hansı bir məsələni təsdiq etdikdə belə onlar bir-biriləri ilə eyni səviyyədə olmurlar. Bizim təsdiqimizlə Cəbrail əleyhissəlamın təsdiqi bir deyildir. İnsanlar arasında da belədir. Təqvaya görə bir-birilərindən seçilirlər. Beləliklə, Uca **ALLAH** Quranında: ***…ALLAH yanında ən hörmətli olanınız ALLAHdan ən çox qorxanınız…*** *-dır* ***(Hucurat, 13)*** - buyurmuşdur. İnsanlar həm də istəklərinə uymamaları üçün və **ALLAH**ın sevdiyi bir əməli işləməsində də bir-birlərindən seçilirlər.

Möminlərin hamısı **ALLAH**ın dostlarıdır. Uca **ALLAH** Quranında belə buyurur:

***Bilin ki, ALLAHın dostlarının heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər. O kəslər ki, iman gətirmiş və pis əməllərdən çəkinmişlər… (Yunus, 62-63).***

İnsanlar imanlarındakı fərqliliklərinə görə dostluq dərəcələrində də bir-birilərindən fərqlidirlər. Onların **ALLAH** dərgahında ən hörmətliləri **ALLAH**a və Onun Elçisinə daha çox itaət göstərməklə Qurana və Sünnəyə riayət edənlərdir. Hər hansı bir məzhəbə ən yaxşı riayət edən deyildir.

## Xülasə

Peyğəmbərdən nə gəlmişdirsə, o haqqdır. İman əhli də imanda eyni dərəcəyə malik deyil, fərqlidirlər. Möminlər **ALLAH**ın dostlarıdır. Onların isə, dərəcələri təqvalarına görə fərqlənir. Kim daha çox təqvalıdırsa, o, **ALLAH**a daha yaxındır.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. İnsanlar imanda bərabərdirlərmi?
2. Övliyaur-Rəhman kimlərdir?



# İYİRMİ BİRİNCİ DƏRS

**66. İman ALLAHa, mələklərinə, kitablarına, peyğəmbərlərinə, axirət gününə, xeyir və şəriylə, ləzzəti və acısıyla qədərə və (onların hamısının) ALLAHdan gəldiyinə iman gətirməkdir.**

## ŞƏRH

İman – **ALLAH**ın zatına, sifətlərinə, əməllərinə, adlarına, ibadət edilməsinə təkcə Onun haqqı olduğuna, bütün işlərin yaradılmasının Ona aid olduğuna, mələklərə və onların sifətlərinə xülasə şəklində və təfsilatı ilə iman; nazil etmiş olduğu Kitablara; iman üçün göndərdiyi tanıdığımız və tanımadığımız peyğəmbərlərin hamısına iman gətirməkdir. Peyğəmbərlərin ilki Nuh əleyhissəlam, sonuncusu isə Məhəmməddir (s.ə.s.). Onların hamısının peyğəmbərliyinə və təbliğ etdiklərinə tam iman gətiririk.

İman, onların göstərdikləri düzgün yolun ən kamil və ən gözəl olduğuna inanmaqdır. Axirətə, yenidən dirilməyə, haqq-hesab gününə, Cənnət və Cəhənnəmə və sairəyə inanmaq da imandandır. Qədərin **ALLAH**dan gəldiyinə, xeyrin və şərin **ALLAH**ın əmri ilə yerinə yetdiyinə, acının və ləzzətin **ALLAH**ın qədəri və iradəsi ilə olduğuna inanmaq da imandandır. Uca **ALLAH** Quranda belə buyurur:

□ ***…Onlara de ki: "Hamısı ALLAH tərəfindəndir…*** □ ***(Nisa, 78).***

Bu üsul bütövlüklə aşadıdakı kəramətli ayədə özünü göstərir:

□ ***…Yaxşı əməl sahibi əslində ALLAHa, axirət gününə, mələklərə, kitaba [ALLAH****ın nazil etdiyi bütün ilahi kitablara* ***] və peyğəmbərlərə inanan…dır…*** □ ***(Bəqərə, 177).***

□ ***Şübhəsiz ki, Biz hər şeyi müəyyən ölçüdə [****lazım olduğu qədər* ***] yaratdıq*** □ ***(Qəmər, 49).***

*** …ALLAHa, Onun mələklərinə, kitablarına, peyğəmbərlərinə və axirət gününə inanmayan şəxs, şübhəsiz ki, [*doğru yoldan*] çox azmışdır  (Nisa, 136).***

İmanın qayda və üsullarından birini itirən, onun əsasını da itirmişdir. Bu kimsənin imanı olmaz, əvəzində ona kafir adı verilər.[96]

**67. Biz bunların hamısına iman gətirir və heç bir peyğəmbəri digərindən ayırmırıq. Onların gətirdiklərinin hamısını təsdiq edir, doğru sayırıq.**

## ŞƏRH

Biz də peyğəmbərlərin hamısına, aralarında heç bir fərq gözləmədən iman gətiririk. Onların gətirdikləri bütün xəbərlərə də iman bəsləyirik.

Uca **ALLAH** Quranında belə buyurur:

*** …"Biz Onun peyğəmbərləri arasında fərq qoymuruq (Bəqərə, 285).***

*** …Onların heç birini digərindən ayırmırıq. Biz ancaq ALLAHa boyun əyən müsəlmanlarıq  (Bəqərə, 136).***[97]

---

[96] *Türk mətninə (**«İmanın erkan ve usüllerinden birisini yitiren, imanın aslını yitirmiştir. Bu kimseden iman kalkar. Bunun yerine kendisine kafir adı verilir»**) uyğun çevrilmiş bu cümlə əsərin ərəb orijinalında:*

فقدُ أصول وأركان الإيمان الستة التي إن فقدَ أحدها ارتفع اسم الإيمان بالأصل وأطلق مكانه اسم الكفر والعياذ بالله – تعالى – .

***«İmanın əsası və dayaqları olan altı şərtini itirməklə, baxmayaraq ki, onlardan birinə xələl gətirməklə belə iman adı köklü surətdə götürülər və əvəzinə küfr adı verilər. Uca ALLAHa sığınırıq».** (R.H.)*

[97] *Türk mətnində aşağıdakı sözlər ixtisar edilmişdir:*

فنحن لا نفرق بين الرسل ، ولانؤمن ببعضهم ونكفر ببعض ، بل نؤمن بهم جميعًا ونصدقهم كلهم في كل ما جاءوا به من الوحي من عند الله – تعالى – .

***«Biz peyğəmbərlərin heç birini digərindən ayırmırıq. Həmçinin onların bir qisminə iman gətirib, digər qismini inkar da etmirik. Əksinə hamısına iman***

## Xülasə

İman **ALLAH**a, mələklərinə, kitablarına, peyğəmbərlərinə, axirət gününə, xeyir və şəriylə qədərə imandır və bunların da hamısı **ALLAH**dandır.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. İmanın şərtləri hansılardır?
2. Qədərə inanmaq nə deməkdir?



---

*gətirərək uca ALLAHın dərgahından enmiş vəhyi bütünlüklə təsdiqləyirik». (R.H.)*

# İYİRMİ İKİNCİ DƏRS

**68. Məhəmməd ümmətindən olan böyük günah sahibləri Cəhənnəm odunda əbədi qalmayacaqlar. Onlar tövhid tərəfdarları[*] kimi öldükdə və tövbə etmiş olmasalar belə, ALLAHa inanaraq və Onu tanıyaraq öldükdən sonra onların bağışlanması ALLAHın istəyinə və hökmünə qalır; istərsə bağışlar. Uca ALLAHın Kitabında buyurulduğu kimi, *ALLAH … istədiyi şəxsin bundan başqa[**] olan günahlarını bağışlar (Nisa, 48).* İstərsə, ədalətilə onları Cəhənnəm odunda cəzalandırar və sonra da mərhəməti sayəsində onları, Ona itaət edən vasitəçilərinin şəfaəti ilə, oradan çıxarıb Cənnətində yerləşdirər. Çünki Uca ALLAH Onu tanıyanların Ağasıdır. Onları, heç də hər iki həyatda Onu inkar edən, hidayətindən uzaqlaşıb ziyana düşən və Onun dostluğuna nail olmayanlar kimi, himayəsiz qoymaz.[98]**

## ŞƏRH

Böyük günah törətmiş insanların hər hansı bir cəza, lənət, Cəhənnəm alovu ilə qorxudulma və ya da o günahların çox dəhşətli bir şəkildə təsvir edilməsi ilə yanaşı, onlar Cəhənnəmdə əbədi olaraq qalmayacaqlar. Çünki onlar, tövhid əqidəsi sahibi olaraq ölüblər. Hətta tövbə etmədən ölmüş olsalar da belə, **ALLAH**a iman gətirib və Onu qəbul edərək ölmüşdürlərsə, onların bağışlanması artıq təkcə **ALLAH**ın istəyinə qalır. İstəsə günahkarı cəzalandırar və əzab verər. Fəqət onu əbədi

---

[*] ***ALLAH**ın rübubiyyət, üluhiyyət, ad və sifətlərində olan təkliyinin və yeganəliyinin tərəfdarı (F.S.)*

[**] ***"…ALLAH Özünə şərik qoşanları əfv etməz, amma istədiyi şəxsin bundan başqa olan günahlarını bağışlar" (Nisa, 48).** İqtibas (F.S.-dur).*

[98] *Aşağıdakı cümlə türk tərcüməsində ixtisar edilmişdir:*

اللهم ياولي الإسلام وأهله ، ثبتنا على الإسلام حتى نلقيك به .

***«Ey İslamın və müsəlmanların Hamisi, Səninlə müsəlman kimi görüşmək üçün bizi İslamda möhkəm et!»** (R.H.)*

Cəhənnəmdə qoymaz. Əksinə, **ALLAH**ın mərhəməti və **Ona** itaət edənlərin şəfaətilə onu Cəhənnəmdən çıxarar. O gün şəfaət edəcək insanların ən böyüyü Məhəmməddir (s.ə.s.). **ALLAH** istərsə onları bağışlayar, hörməti və ləyaqəti ilə onu bağışlayar. Şirkdən başqa qalan bütün günahların **ALLAH** tərəfindən bağışlanmasına ümid edilir. Əziz və cəlil **ALLAH** Kitabında belə buyurur:

***ALLAH Özünə şərik qoşanları əfv etməz, amma istədiyi şəxsin bundan başqa olan günahlarını bağışlar (Nisa, 48).*** **ALLAH**ın Elcisi (s.ə.s.) də belə buyurmuşdur: *"Kim ki, bu günahlardan bəzisini işlədərsə və* ***ALLAH*** *da onu gizlədərsə, onun vəziyyətinin necə olacağını* ***ALLAH*** *bilər. İstəsə onu bağışlar, istəsə əzab verər"*[99].

Həqiqət budur. Ola bilsin ki, günah işlədən tövbə etmədən ölsün. Mötəzililər və xaricilərin iddialarının əksinə, o, Cəhənnəmdə həmişəlik qalmayacaq. Bu isə **ALLAH**ın mərhəmətindəndir ki, **O**, **Onu** tanıyıb iman gətirənləri, inkar edib tanımayanlarla bir tutmur. Beləliklə, Uca **ALLAH** Kitabında belə buyurur:

***Yoxsa dünyada pis əməllər edənlər [****axirətdə****] onları iman gətirib yaxşı işlər görənlərlə bir tutacağımızı, onların həyatlarının və ölümlərinin eyni olacağını güman edirlər?! (Casiyə, 21).***

***Məgər Biz müsəlmanları kafirlərlə eynimi tutacağıq?! (Nun və ya Qələm, 35).***[100]

---

[99] *Buxari, Kitabul-iman, Babu Əlamətul-imani hubbul-ənsar, 1/64 (11); Müslim,Kitabul-hudud, Babul-hududi kəffarətun li əhlihə, 3/1333 (1709). Hər iki rəvayət Əbu İdris Aid b. Abdillah və Ubadə İbn Samitdəndir.*

[100] *Aşağıdakı cümlə türk tərcüməsində ixtisar edilmişdir:*

ونسأل الله ولي الإسلام وأهله أن يثبت قلوبنا على الإسلام حتى نلقاه مسلمين مؤمنين .. آمن

.

***«İslamın və müsəlmanların Hamisi olan Allahdan diləyimiz budur ki, qəlblərimizi Onunla müsəlman və mömin kimi görüşmək üçün İslamda möhkəm etsin! Amin».*** *(R.H.)*

**69. Qiblə əhlinin saleh və ya pis əməlli insan olmasından asılı olmayaraq onların hər birisinin arxasında namaz qılınacağı və onlardan ölənlərin cənazə namazının da qılınacağı fikrindəyik.**

**70. Onlardan hər hansı birisinin nə Cənnətlik və nə də Cəhənnəmlik olmasına dair qəti surətdə şahidlik edə bilmərik. Onlardan hansı birininsə nə kafirliyinə, nə müşrikliyinə və nə də münafiqliyinə, onlardan buna əsas verən dəlillər almasaq şahidlik etmərik. Əksinə, onların gizli tərəflərini Allaha tapşırarıq.**

**71. Qılıncı haqq edəndən başqa, Məhəmməd** (s.ə.s.) **ümmətindən kiməsə qılınc vurulması fikrində deyilik.**

## ŞƏRH

Sünnə və camaat əhli kimi, möminlərdən olan hər bir yaxşı və pis əməl sahibinin ardında namaz qılarıq. Ancaq burada yaxşı əməl sahibinin imam olmasını güc tətbiq edilməməsi şərti ilə daha üstün hesab edirik. Ancaq imam hakimiyyət başçısı tərəfindən təyin edildikdə və onun ardıyca namaz qılmamaq fitnəyə səbəb olacaqsa, qılınır. Bu isə onun insanı küfrə salacaq bir bidət əhli olmaması ilə bağlıdır.

Beləliklə, Sünnə və camaat əhli müsəlman kimi ölən yaxşı və pis əməlli insanların üstündə cənazə namazı qılmağı münasib sayır. Ancaq kimsə dinsiz kimi ölmüşsə, ona qəti surətdə cənazə namazı qılmaq olmaz.

Qiblə əhlindən olan hər hansı bir insanın Cənnətlik və ya Cəhənnəmlik olması qətiyyən söylənilməz. Əksinə, onlardan yaxşılıq edənlər üçün Cənnət dilər, onun **ALLAH**ın qarşısında cavabdeh olmasını inkar etmərik.

Kim pisliklər edibsə, onun halına acıyarıq, **ALLAH**ın mərhəmətindən ümidimizi kəsmərik.

Heç bir müsəlman haqqında bir dəlil olmadıqca, (təkfir üçün qoyulan – red.) şərtlər gerçəkləşmədikcə və maneələr götürülmədikcə, onu dindən çıxaracaq küfrünə, şirkinə və

nifaqına şahidlik etmərik. Onların gizli tərəflərini **ALLAH**a tapşırarıq. Çünki **ALLAH** hər şeyi bildiyi halda, insanlar əməllərin ancaq zahirini bilirlər.

Sünnə və camaat əhli **ALLAH**dan və Peyğəmbərindən (s.ə.s.) hökmü verilməyən məsələ barədə bir müsəlmanın belə öldürülməsini caiz saymaz. Çünki, **ALLAH**ın Peyğəmbəri (s.ə.s.) belə buyurmuşdur: *"Müsəlman olan şəxsin ancaq üç şeyə görə qanı halal olar… qana qan"*[101]. *"Ancaq **ALLAH** dərgahından qəti və açıq bir küfr olduğuna dəliliniz varsa…"*[102].

Uca **ALLAH** da Kitabında belə buyurmuşdur:

***ALLAHa və Peyğəmbərinə qarşı vuruşanların, yer üzündə fitnə-fəsad salmağa çalışanların cəzası ancaq öldürülmək… -dir (Maidə, 33).***

## Xülasə

Böyük günah işlədənlərin vəziyyəti **ALLAH**ın mərhəmətinə qalıb. İstəsə onları cəzalandırar, istəsə bağışlar. Təsdiqləyənlə təkzib edənin bərabər olması mümkün deyildir. Pis və ya saleh əməl sahibi olmasından asılı olmayaraq hər müsəlmanın arxasında namaz qılar və cənazəsinin yola salınmasında iştirak edərik. Qəti şəkildə kiminsə Cənnət və ya Cəhənnəm əhli olduğunu söyləmərik. Tutarlı bir səbəb olmadan heç bir müsəlmana qılınc qaldırmarıq.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Əhli Sünnənin böyük günah işləyənlər haqqındakı baxışları necədir?
2. Pis əməl sahibi olan müsəlmanın ardında namaz qılınırmı?
3. Hansı məsələlərdə müsəlmanın qətli mümkündür?

---

[101] *Buxari, Kitabul-diyət, 12/201 (6878); Müslim, Kitabul-qasəmə, Babu mə yubəhu bihi dəmul-muslimi, 3/1303 (1676) Abdullah b. Məsudun (A.r.o.) rəvayətidir.*

[102] *Müslim, Kitabul-imarə, Babu vucubi Taatil-uməra fi qeyri məsiyətin, 3/1470 (42), Ubadə İbnus-Samitin hədisi.*

# İYİRMİ ÜÇÜNCÜ DƏRS

**72. Müsəlman əmr sahiblərinə[*] və imamlarımıza, onlar haqsız olsalar da, əks çıxmağı münasib görmürük və onların əleyhinə dua etmirik. Onlara itaət etməkdən kənara çəkilmirik. Onlar bizə günah işlətməyi əmr etmədikcə, onlara itaəti ALLAHa itaət çərçivəsində vacib bilirik. Onlara islah olmaları və bağışlanmaları üçün dua edərik.**

**73. Sünnəyə və Camaata tabe olar, yekdilliklə qəbul olunmuş qaydalara qarşı çıxmaz, ixtilaf[**] etməz və təfriqəçilikdən uzaq durarıq.**

## ŞƏRH

Sünnə və camaat əhli, insanlara zülm edən və şəxsən günahkar olan və idarəçilik məsuliyyətini öz üzərinə götürmüş hakimiyyət sahiblərinə və imamlara qılınc qaldırmağın haram olduğuna inanır. Bunun səbəbi isə, onlara qarşı üsyanda qan tökülməsi, iğtişaşlar yaranması kimi çox pis nəticələrin baş verəcəyindədir.

Bu isə, hökmdarların İslam çərçivəsindən kənara çıxmayaraq, **ALLAH**ın dinini dəyişdirməmələri və onların kafirlik etməmələri şərti ilə bağlıdır. Belə vəziyyətdə Sünnə və camaat əhli, hökmdarlar yaxşı işləri əmr edib pis işlərdən çəkindirdikləri surətdə onların əleyhinə dua etməyi və onlara qarşı çıxmağı[***] şəriətə uyğun saymır və bu itaəti özlərinə vacib hesab edirlər. Ancaq o zaman ki, belə hakimlər insanlara günah olan şeyləri əmr etsələr, onlara itaət edilməz. **ALLAH**ın Elçisi (s.ə.s.) belə buyurmuşdur:

---

[*] *Hakimiyyət nümayəndələri nəzərdə tutulur (F.S.).*

[**] *Münaqişə, mübahisə (F.S.).*

[***] *Üsyan etməyi, itaət etməməyi (F.S.).*

*"Müsəlman insan üçün vacib sayılan, əmr edilənə, o günah olmadıqca, istəsə də, istəməsə də, itaət etməsidir"*[103].

*"İtaət ancaq yaxşı işlərdədir"*[104].

Əmr sahiblərinin dində islahı və bağışlanması üçün dua edərlər. Çünki onların yaxşılığı, ummətin yaxşılığı, onların fəsada uğraması isə, ümmətin fəsada uğramasıdır. Daha doğrusunu **ALLAH** bilir.

Sünnə və camaat əhli müsəlmanlara qarşı çıxmırlar. Əksinə, onlar düzgün yolu **ALLAH**ın Peyğəmbərinin (s.ə.s.) Sünnəsinə və müsəlman camaatına uyğun davranmaqda, zəlaləti, nadanlığı isə camaatdan ayrı düşməkdə, dini məsələlərdə ixtilaf etməkdə, müxalifətdə qalmaqda, müsəlmanların arasında ayrı-seçkilik salmaqda görürlər. Bu, müsəlman camaatın **ALLAH**ın əmrlərinə sahib çıxaraq, onları müdafiə etməklə mümkün olur.

Amma insanlar korlandıqda, şəriətin hökmləri dəyişdirilərək, sünnələr bidət və bidətlər sünnə səviyyəsinə qaldırıldıqda, pis əməllər yaxşı, yaxşılar isə pis qəbul olunduqda insanlardan uzaqlaşıb təkbaşına yaşamaq daha yaxşıdır. İstəklərinə uyan və zəlalət əhli olanlar da beləcə tərk edilir. **ALLAH**ın Peyğəmbəri (s.ə.s.) insanların tamamilə korlandığı bir zamanda belə davranılmasını buyurmuşdur:

*"...O zaman bu firqələrin hamısın tərk et. Hətta, ağacın kökünü dişinlə tutmalı olsan belə,*[105] *ölüm sənə çatıncaya qədər gözlə"*[106].

---

[103] *Buxari, Kitabul-Əhkam, Babus-Səmi vət-Taati lil-imam, 13/121 (7144), Müslim, Kitabul-İmərа, Babu Vucubi Taatil-Umərai fi Ğeyri Məsiyətin, 3/1469 (1839) Abdullah İbn Ömərdən rəvayət edilib.*

[104] *Müslim, Kitabul-İmərа, Babu vucubi Taatil-Umərai fi Ğeyri Məsiyətin, 3/1469 (1840) Əli əleyhissəlamdan rəvayət edilən hədisdir.*

[105] *Peyğəmbər (s.ə.s.) bu fitnələrə məruz qalan insanı fırtına burulğanına düşmüş adama bənzədir. Qurtuluş uğrunda mübarizə aparan bu şəxsin taqətsizlikdən qolları yanına düşdükdə belə, ona təslim olmamağı və ağacın kökündən dişlərilə də olsa, tutmağı tapşırır. Daha doğrusunu Allah bilir. (R.H.)*

**74. Ədalət və əmanət əhlini sevər və zülm və xəyanət əhlinə nifrət edərik.**

## ŞƏRH

İstər idarəedən olsun, istərsə də idarəedilən, ədalətli olan hər kəsi sevərik. **ALLAH**la və insanlarla birgə olan sadiq insanı sevər; hər hansı bir zülmkara, **ALLAH**ın Peyğəmbərinə (s.ə.s.) xəyanət edən hər bir kimsəyə, onun rəhbər və ya rəhbərlik edilən olmasından asılı olmayaraq, nifrət bəslərik.

Uca **ALLAH** Kitabında belə buyurur:

***Ey iman gətirənlər! Bilə-bilə ALLAHa, Onun Peyğəmbərinə və aranızdakı əmanətlərə xəyanət etməyin! (Ənfal, 27).***

Bunu həqiqət görürük. Mömin, təqva sahibi olan möminləri sevər, günahkar pozğunlara isə nifrət bəslər. **ALLAH**ın Peyğəmbəri (s.ə.s.) hədislərində belə buyurmuşdur:

*"Kimdə bu üç şey olarsa, imanın ləzzətini duyar: Allah və Rəsulunu hər kəsdən daha çox sevən və bir kimsəni sevərkən, onu Allah xatirinə sevən şəxs…"* [107].

*"İmanın ən sağlam qulpu **ALLAH** rizası üçün sevmək və **ALLAH** rizası üçün nifrət bəsləməkdir"*[108].

Biz bir kimsəni onun itaəti və təqvası qədər sevər, günahı və pozğunluğu qədər də ona nifrət edərik.

---

[106] *Buxari, Kitabul-Mənəqib, Babu Ələmətun-Nubuvvə, 6/615 (h. 3606); Müslim, Kitabul-İmərə, Bab vucubi Muləziməti Cəmaatil-Muslimin, 3/1475 (h. 1847) Hüzeyfə b. Yəməndən rəvayət edilib.*

[107] *Mutəfiqun əleyh, Ənəs b. Malikdən.*

[108] *Əhməd, ət-Tabərani. əl-Əlbani, "Səhihul Camidə" (2530) bu hədisə səhih deyilmişdir.*

## Xülasə

Sünnə əhlinə görə, imanlı olduqları müddətdə imamlara itaət etmək vacibdir.[109] Haqsız yerə Müsəlman camaatını bölmək qəbul olunmazdır. Sünnəyə və camaata tabe olarıq. Ədalətli və sadiq olanları sevərik, zalım və xain olanlara nifrət bəsləyərik.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Zalım hökmdara itaətin hökmü necədir?
2. Zalım hökmdara qarşı çıxmanın hökmü necədir?
3. Allah xatirinə sevməyin və Allah xatirinə nifrət etməyin ölçüsü nədir?



---

[109] *Bu cümləni əsərin ərəb orijinalı ilə:*

طاعة الأئمة واجبة في طاعة الله

*müqayisə etdikdən sonra onun türk dilindəki (yəni, «**Ehl-i Sünnete göre, iman üzere oldukları müddetce imamlara itaat etmek vaciptir**») ifadəsi ilə razılaşmayaraq bir daha tərcümə etməyə səy göstərdik: **«Əmr sahiblərinə itaəti ALLAHa itaət çərçivəsində vacib bilirik»**.(R.H.)*

# İYİRMİ DÖRDÜNCÜ DƏRS

**75. Mənası şübhəli görülən şeyə "ALLAH daha yaxşı bilir" deyirik.**

**76. Rəvayətlərdə bildirildiyi kimi, həm səfərdə və həm də səfərdən başqa hallarda, ayağa geyilmiş xüflərin* üstünə məsh çəkməyə icazə verildiyini hesab edirik.**

**77. Həcc və cihad müsəlmanların ədalətli və ya zalım əmr sahibləri ilə bərabər Qiyamətə qədər davam edəcək. Heç bir şey bunu ləğv edə bilməyəcək.**

## ŞƏRH

Sünnə və camaat əhli daima mənası mürəkkəb anlaşılan bilikləri **ALLAH**a məxsus sayır və "**ALLAH** daha yaxşı bilir" deyir. Ən ədalətli olan da elə budur. Bundan məqsəd isə, hər hansı sözü **ALLAH**ın adına çıxarmamaqdır. **ALLAH**ın adına söz qoşmaq günahların ən böyüyü və ən çirkinidir. İnsandan bilmədiyi bir şey soruşulduqda, "**ALLAH** daha yaxşı bilir" deməlidir.

Sünnə və camaat əhli, fiqh kitablarında olduğu kimi, səfərdə olan üçün üç gün, daima bir yerdə yaşayanlar üçün isə bir gün* xüflərin üstündən məsh çəkməyi icazə verilmiş sayırlar. Beləcə, corab və çarığın üstünə məsh edilməsini qəbul edirlər. Rafizilər** isə buna qarşı çıxmışlar. Baxmayaraq ki, xüflərin üstünə məsh etmək mütəvatir hədislərdə öz əksini tapmışdır.

---

* ***Xüff*** *– ayağa geyilən dəri çarığdır (F.S.).*

* *Bir gecə-gündüz nəzərdə tutulur (F.S.).*

** *Rafizi təriqətinin tərəfdarları. Rafizi – rədd (inkar) edənlər, şiələrin, əsasən imamət tərəfdarlarına verilən ləqəbdir. Bəzi müəlliflər iddia edirlər ki, ilk rafizilər səbailərdər, Abdullah b. Səbanın tərəfdarlarından imişlər ki, sonuncu Əbu Bəkrin və Ömərin imamlığını inkar (rəfədə) edərək, Məhəmməd Peyğəmbərin (s.ə.s.) Əlini (A.o.r.) öz xələfi təyin etdiyini iddia*

Müsəlmanlar, ədalətli və ya zalım insan olmasından asılı olmayaraq, İslam çərçivəsindən çıxmadıqca, onlara rəhbərlik edənlərlə birgə Qiyamət gününə qədər həcc və cihadın davam edəcəyinə iman gətirərlər.[110]

---

*edir. Digər müəlliflər rafiziləri Kufə şiələri (tərəfdarları) adlandırırlar ki, onlar 739-cu ildə üsyan qaldırmış Zeyd b. Əlinin (**ALLAH** hər ikisinə rəhmət etsin) imamlığını, o, Əbu Bəkrin və Ömərin imamlığının qanuniliyini qəbul etdiyinə və öz nəslinin təlimi ilə razılaşmadığına görə, "inkar" etmişdilər. Zeyd tərəfdarları onlardan ayrıldıqdan sonra, əsasən imamət tərəftarları olanları rafizi adlandırmağa başladılar ki, onlar  nəinki Əbu Bəkrin və Ömərin (A.o.r.o.), hətta Əməvilər və Abbasilərin xəlifəliyini də "inkar" edirdilər. "İslam: Gnüiklopediçeskiy slovarğ", M., "Nauka", 1991, səh. 198 (İqtibas tərcüməçinindir, F.S). Rus dilində olan göstərdiyimiz mənbədə sitatlar aşağıdakı müəlliflərdən götürülmüşdür: ən-Noubəxti, Şiə təriqətləri, səh. 128, qeyd. 44 (rus d.); əl-Əşari, Məqalət, 16-17; əl-Bağdadi, Əl-Farq, 21, 29; əş-Şəhristani, Dinlər haqqında kitab, 42, 137-138 (rus d.); W.M.Watt The Rafidites: preliminary study. Or. 1963, 16, 110-12 .*

[110] *Türk dilinə (yəni, **«Müslümanlar, facir olsun salih olsun, İslam dairesinden çıkmadığı müddetce Emirleriyle beraber Kiyamet gününe kadar Hacc ve Cihadın sürecegine iman ederler»** sözlərinə) uyğun çevrilmiş bu cümləni əsərin ərəb orijinalı ilə:*

ويرون الحج والجهاد باقيين مستميرين مع أمراء المسلمين ، البر والفاجر ، لا يبطلهما شيء ولا ينقضهما ، ولا يرفع حكم وجوبهما وذلك إلى قيام الساعة ، كل ذلك مع الأئمة العدول والجورة ، فالجائر قوته للمسلمين وجوره على نفسه ، ما داموا باقين في حظيرة الإسلام ، أما إن خرجوا من الإسلام فذلك شيء آخر .

*müqayisə etdikdə onun müxtəsər şəkildə çevrildiyi aşkar olundu. Həmin ifadənin tam tərcüməsi aşağıdakı kimidir: **«Əhli Sünnə və camaat, ədalətli və ya zalım olmasından asılı olmayaraq müsəlmanlara rəhbərlik edən şəxslərlə birgə həcc və cihadın davam edəcəyini məqsədəuyğun hesab edirlər. Qiyamət gününə qədər heç bir şey bunları ləğv edə, poza və ya özündə daşıdığı vaciblik hökmünü götürə bilməz. Bütün bu işlər ədalətli və ya zalım imamların rəhbərliyi ilə həyata keçirilər. Zalımın qüvvəsi müsəlmanların xeyrinə, zülmü isə özünün zərərinə olar. Bu onların İslam çərçivəsindən çıxmadığı müddətdə davam edər. İslamdan üz döndərmələri isə, başqa bir məsələdir»**. (R.H.)*

## Xülasə

Bir müsəlmana vacib olan şey, bilmədiyinə "**ALLAH** daha yaxşı bilir" deməsidir. Bilmədiyi bir şeyi özünü çətinliyə salaraq, bilmiş kimi göstərməməlidir. Səfərdə olduğu vaxtlarda və başqa hallarda xüff üstünə məsh etməyə icazə verilir. Həcc və cihad, ümmətə rəhbərlik edənlərin ədalətli və ya zalım insan olmasından asılı olmayaraq, Qiyamətə qədər davam edəcək.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Bir şey soruşulduqda bilməsən, nə deməlisən?
2. Xüfün üstünə məsh etmənin hökmü və müddəti necədir?
3. Zalım rəhbərlərlə cihad və həccin hökmü necədir?



# İYİRMİ BEŞİNCİ DƏRS

**78. Uca ALLAHın Kiramulkətibin* mələklərini üstümüzdə qoruyucu kimi vəzifələndirdiyinə inanırıq.**

**79. Aləmlərdəki (məxluqatdan – red.) canları almaq vəzifəsi olan ölüm mələyinə də inanırıq.**

**80. Qəbir əzabına layiq olanların o əzabı görəcəklərinə, Münkər ilə Nəkir adlı mələklərin qəbirdə insana Rəbbi, dini və peyğəmbəri haqqında sual verəcəklərinə dair ALLAHın Elçisindən (s.ə.s.) və Onun (s.ə.s.) əshabələrindən gələn xəbərlərə inanırıq.**

## ŞƏRH

Sünnə və camaat əhli Kiramulkətibin mələklərinə inanır. **ALLAH** onlara əməllərimizi yazmaq vəzifəsi tapşırmışdır. O mələklər sözlərimizi, davranışımızı qeyd edirlər. Bizi ancaq ayaq yolunda və cinsi əlaqə gedişində tərk edirlər. Uca **ALLAH** Qurani Kərimdə onlardan bəhs edir:

 ***Sizin üstünüzdə gözətçi mələklər** – [əməllərinizi] **yazan və** [ALLAH dərgahında] **çox hörmətli olan mələklər vardır. Onlar sizin nə etdiklərinizi bilirlər*  ***(İnfitar, 10-12).***

O mələklərdən bəziləri Raqib** və bəziləri Atidir***:

 ***Dediyi hər sözü** [yazmaq üçün] **onun yanında hazır durub gözləyən** [iki mələk] **vardır***  ***(Qaf, 18).***

Sünnə və camaat əhli, insanların və cinlərin canını almaq üçün Uca **ALLAH**ın vəzifə tapşırdığı ölüm mələyinə iman gətirirlər. Uca **ALLAH** Qurani Kərimdə belə buyurur:

---

* *Hər bir insanın savab və günahlarını yazmaq üçün onun sağ və sol çiyinlərində qərar tutan iki mələk (F.S.).*

** ***Raqib –** hazır duran; (F.S.)*

*** ***Atid** – gözləyən (F.S.)*

□ *[Ya Məhəmməd!]* ***De ki: "Sizə müvəkkil olan ölüm mələyi canınızı alacaqdır. Sonra da*** *[qiyamət günü]* ***Rəbbinizin hüzuruna qaytarılacaqsınız!*** □ ***(Səcdə, 11).***

Burada ölümün ölüm mələyinə aid edilməsi onun ölüm hadisəsində vəzifəsi ilə bağlıdır. Əslində öldürən **ALLAH**dır, ölüm mələyinin vəzifəsi isə can almaqdır. Həqiqətdə əməli yerinə yetirən **ALLAH**dır:

□ ***ALLAH*** *[əcəli çatan kimsələrin]* ***canlarını*** *[ruhlarını]* ***onlar öldüyü zaman…alar*** □ ***(Zumər, 42).***

Burada hər hansı bir ziddiyyət yoxdur. Bu mələk **ALLAH**ın əmri ilə canları alır. O, ən əzəmətli mələklərdəndir. Onun haqqında Quran və Sünnədə məlum bir ad yoxdur. Adı barəsində gəzən xəbərlər də həqiqətə uyğun deyildir. Bu, kitab əhlinin sözlərindən yarananlardır.

Sünnə və camaat əhli, kafirlərin və münafiqlərin həqiqi qəbr əzabını çəkəcəyinə iman gətirirlər. Eyni zamanda müsəlman günahkarların əzab çəkəcəklərinə inanırlar. Qəbir əzabı dedikdə bildiyimiz qəbir çökəyində çəkilən əzab deyil, "Bərzəx" adı verilmiş bir aləmdə çəkilən əzab nəzərdə tutulur. Əzaba layiq insanlar qəbirdə də, yerin altında da, dənizin dibində və ya balıqların qarnında da olsalar, onu məhz bərzəxdə çəkəcəklər. Sünnə və camaat əhli bunun, layiq olanlar üçün ədalətli sonuc olduğuna inanırlar. Munkir və Nəkir hər bir insana qəbrində Rəbbin kimdir? Hansı dindənsən? Peyğəmbərin kimdir? deyə, sual verən sərt təbiətli iki mələkdir. Bu xəbərlərin hamısı Peyğəmbərdən (s.ə.s.) mütəvatir rəvayət edilmə yolu ilə bizə çatmışdır.[111] Sübuta yetmiş bu deyilənlərə iman gətirmək zəruridir.

**81. Qəbir ya Cənnət baxçalarından bir baxça, ya da Cəhənnəm quyularından biridir.**

---

[111] *Aşağıdakı cümlə türk tərcüməsində ixtisar edilmişdir:*

فوجب اعتقاد مادلت عليه .

***«Sübuta yetmiş bu deyilənlərə iman gətirmək vacibdir».*** *(R.H.)*

## ŞƏRH

Qəbir pak möminə Cənnət baxçalarından olan bir baxçanı xatırladır. **ALLAH** onu qəbrində mələklərin sualları qarşısında möhkəm saxlar. Kafir və münafiqlər üçünsə qəbir Cəhənnəm quyularından biri olar. **ALLAH** müsəlmanlardan olan zalım və günahkarları da qəbr əzabı ilə cəzalandırar. Hərcənd, bu "qəbir ya Cənnət baxçalarından biri və ya da Cəhənnəm quyularından biridir" ifadəsi **ALLAH**ın Elçisindən (s.ə.s.) səhih bir yolla gəlməmişdir. Lakin belə bir nəticə Ondan (s.ə.s.) gələn mütəvatir hədislərin mənasından çıxarılmışdır.

### Xülasə

Biz Kiramulkətibinə inanırıq. Ölüm mələyinə inanırıq. Qəbirdə sorğu-suala, qəbr əzabına və mükafatına inanırıq. Münkər və Nəkirə inanırıq. Qəbir haqqında gələn səhih gələn hər bir xəbərə inanırıq.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Kiramulkətibin kimlərdir?
2. Ölüm mələyi haqqında nə bilirsiniz?
3. Qəbirdə əzab və mükafat haqqında nə bilirsiniz?
4. Munkər və Nəkir kimlərdir?



# İYİRMİ ALTINCI DƏRS

**82. Öləndən sonra diriləcəyimizə, Qiyamət günü əməllərimizin əvəzinin veriləcəyinə, sorğu-suala çəkiləcəyimizə və haqq-hesab verəcəyimizə, hər kəsin öz kitabını** (əməl dəftəri) **oxuyacağına, savaba, cəzaya, sirata və mizana iman gətiririk.**

**83. Cənnət və Cəhənnəm yaradılmışdır, heç vaxt yox olmayacaqdır. Uca ALLAH yaratdıqlarından heç birini yaratmamışdan əvvəl Cənnət və Cəhənnəmi yaratmışdır. Hər ikisi üçün onlara daxil olacaq məxluqları yaratdı. ALLAH onlardan istədiyini lütfü ilə Cənnətə, istədiyini də ədaləti ilə Cəhənnəmə salar. Hər kəs gedəcəyi yerə uyğun iş tutar və ona görə yaradılmış olan yerə doğru gedər.**

## ŞƏRH

Sünnə və camaat əhli **ALLAH**ın Qiyamət günü ölüləri yenidən dirildib onlara işlətdikləri əməllərə görə əvəzini verəcəyinə iman gətirir. Uca **ALLAH** Kitabında belə buyurur:

 ***Kafir olanlar öldükdən sonra əsla dirildilməyəcəklərini iddia edirlər. [****Ya Peyğəmbər!****] De ki: "Bəli, Rəbbimə and olsun ki, siz mütləq diriləcəksiniz. Sonra da [****dünyada****] etdiyiniz əməllər sizə [****bir-bir****] xəbər veriləcəkdir. Bu, ALLAH üçün çox asandır!*** ***(Təğabun, 7).***

Sünnə və camaat əhli əməllər haqqında Qiyamət günü **ALLAH**a ərz ediləcəyinə iman gətirirlər. Uca **ALLAH** Qurani Kərimdə belə buyurur:

 ***O gün [****ey insanlar!****] siz [****haqq-hesab üçün****] Rəbbinizin hüzuruna gətiriləcəksiniz. Sizin heç bir sirriniz [ALLAH****dan****] gizlin qalmayacaqdır*** ***(Haqqə, 18).***[112]

---

[112] *Aşağıdakı cümlə türk tərcüməsində ixtisar edilmişdir:*

وبالحساب حيث يحاسب الله كل إنسان بما عمل ، وبقراءة الكتاب كما قال – تعالى –:

□ *[Və ona belə deyərik]:* ***"Oxu kitabını*** *[əməl dəftərini]*. ***Bu gün sən özün-özünə haqq-hesab çəkməyə*** *[özün öz əməllərinin şahidi olmağa]* ***kifayətsən!*** □ ***(İsra, 14)***.

Sünnə və camaat əhli yenə də yaxşılıq edənlərin əvəzinə yaxşılıq, pislik edənlərin də əvəzinə cəza alacaqlarına; xeyirxahlığın on misli və yaxud bir qədər artıq mükafatlandırılacağına, bədxahlığın isə eynilə bir misli qədər əvəzi veriləcəyinə və yaxud bağışlanacağına, Cəhənnəmin üzərində qurulacaq sirat körpüsünə iman gətirirlər. Sirat tükdən nazik, qılıncdan itidir. Saleh əməl sahibləri onu keçib Cənnətə girəcək. Əzaba düçar olunmuşları isə onun üstündən Cəhənnəmə atırlar.

Sünnə əhli ayrıca olaraq mizanın* haqq olduğuna inanırlar. Mizanla qulların əməlləri ölçülür, yaxşılıqları və pislikləri tərəzidə çəkilir. O, həqiqi tərəzidir.

Sünnə və camaat əhli bu anda Cənnət və Cəhənnəmin varlığına inanır. Cənnət təqvalı insanların yurdu, Cəhənnəm isə kafirlərin və günahkarların yurdudur. Günahkarların cəhənnəm odu əbədi yanmayacaqdır. Kafirlərin odu isə əbədi olaraq sönməz qalacaqdır. Cənnət də, Cəhənnəm də əbədi olaraq qalacaq və yox olmayacaq. Uca **ALLAH** Cənnəti və Cəhənnəmi bütün yaratdıqlarından əvvəl xəlq etmişdir. Hər ikisinə daxil olacaq insanları və cinləri **O,** yaratmışdır.

Cənnət əhli Cənnət əhlinə məxsus əməllər işlədərək ölürlər. Cəhənnəm əhli də Cəhənnəm əhlinə məxsus əməllər işlədərək ölürlər. Cənnət əhli **ALLAH**ın lütfü ilə Cənnətə, Cəhənnəm əhli isə **ALLAH**ın ədaləti ilə Cəhənnəmə daxil olarlar.

Hər bir insan **ALLAH**ın onun üçün müəyyən etdiyi qədər əməlləri yerinə yetirir və **ALLAH**ın istədiyi yerə doğru üz tutur.

---

***«(****Sünnə və camaat əhli****) haqq-hesab veriləcəyinə, ALLAHın hər bir insanı əməllərinə görə sorğu-suala çəkəcəyinə və kitabın (****hər kəsin əməl dəftərinin****) oxunacağına iman gətirir. Uca ALLAH buyurur...».*** *(R.H.)*

* ***Mizan*** *– ölçü, meyar, tərəzi. Qiyamət günü hər bir kəsin savab və günahlarını müəyyən etmək üçün ölçü vasitəsi olan tərəzi (F.S.).*

**84. Xeyir və şər ALLAH tərəfindən (yaradılaraq) qullara qismət edilmişdir. Hər hansı bir xeyir və şər ALLAHın hökmü və qədəri ilə olur.**[113]

## ŞƏRH

 ***…Onlara de ki: "Hamısı ALLAH tərəfindəndir…  (Nisa, 78).***

 ***…Biz sizi xeyir və şərlə [****sağlamlıq, var-dövlət, cah-cəlal və xəstəlik, yoxsulluq və ehtiyacla*** ***] sınağa çəkərik…  (Ənbiya, 35).***

Bu kainatda cərəyan edən xeyir və şərin hamısı **ALLAH**ın müəyyən etdiyi qədərlə və iradəsilə baş verir. **ALLAH** nəyi istərsə, o da olar, nəyi də istəməzsə, o olmaz.

**85. Bir işin başa gəlməsi üçün lazım olan bacarıq (qüvvət və qüdrət) həmin işlə birgə olur. Yaradılmışların bu bacarıq vasitəsilə təsvir edilməsi bəyənilmir. Fəqət, sağlamlıq, güc, iş üçün əlverişli şərait və əzaların sağlam olması cəhətdən nəzərdə tutulan bacarıq işdən öncə olur. İnsanı məsuliyyətli edən müraciət də bununla əlaqədardır. Belə ki, Uca ALLAH:  *Biz heç kəsi gücü çatmayan işi görməyə vadar etmərik*  *(Muminun, 62)* deyə buyurmuşdur.**

## ŞƏRH

---

[113] *Türk mətninə (**«Hayır ve şer Allah katından –yaratılarak– kullara takdir edilmiştir. Hayır ve şerrin her biri Allahın hükmü ve kaderi iledir»**) uyğun çevrilmiş bu iki cümlə məzmunlarından göründüyü kimi eyni mənanı ifadə edirlər. Əsərin ərəb orijinalına baxdıqda onların bir cümlədən ibarət olduğu məlum oldu:*

والخير والشر مقدران على العباد .

***«Xeyir və şər (****ALLAH tərəfindən*** ***) qullara təqdir edilmişdir»****.(R.H.)*

Gücü çatmaq iki cürdür:

Birincisi, iş, güc, iş üçün imkan mənasında, davranış vasitələri deməkdir. Bunlar, başlıca olaraq, işdən öncə gəlir. Əmr və qadağa bu təməl üzərində qurulur. Müraciət və təklif buna bağlıdır. Uca **ALLAH** Kitabında belə buyurur:

 ***ALLAH heç kəsi qüvvəsi çatmayan işi** [görməyə] **vadar etməz  (Bəqərə, 286).***

 ***…ALLAH heç kəsi Özünün ona verdiyindən artıq xərcləməyə məcbur etməz…  (Talaq, 7).***

İkincisi isə, qüdrət və iradə deməkdir ki, iş bununla birgə olur. Bu, **ALLAH**ın uğur qazandırması və doğru yol göstərməsi anlamındadır.

**86. Qulların işləri ALLAHın yaratması və qulların nail olması ilə başa gəlir.**

**87. ALLAH qullarını ancaq onların gücləri çatacaq qədər iş görməyə vadar edər. Qullar da ancaq ALLAHın onlara verdiyini yerinə yetirə bilərlər. Bu isə "Lə həvlə və lə quvvətə illə billəh"** (Allahdan başqa güc və qüvvət sahibi yoxdur – red.) **kəlamının təfsiridir. Biz** (bu kəlamla)**: Heç kim ALLAHın köməyi olmadıqca, ALLAHa asi olmaqdan uzaq qalmağa çarə tapa bilməz, başqa bir tərəfə yönələ bilməz və hər hansı bir hərəkət edə bilməz. Demək istəyirik ki, Uca ALLAHın tovfiqi (uğura çatdırması) olmadıqca da heç kim ALLAHa itaət etməyi yerinə yetirə bilməz, onu davam etdirməyə gücü çatmaz.**

**88. Hər şey ALLAHın istəməsi, qəzası (hökmü) və qədəriylədir. ALLAHın istəyi bütün istəklərdən üstündür. ALLAHın qəzası bütün iradələri məğlub edir. O, istədiyi işi icra edər. Bununla bərabər, ALLAH bu işdə əsla zülm etməz. O hər növ zülm, pislik, eyb və qüsurdan uzaqdır:** ***ALLAH gördüyü işlər barəsində sorğu-sual olunmaz; onlar** [bütün bəndələr] **isə** [tutduqları əməllərə görə] **sorğu-sual ediləcəklər  (Ənbiya, 23).***

## ŞƏRH

Qulların bütün əməlləri **ALLAH** tərəfindən yaradılır: ** …sizi də, sizin düzəltdiklərinizi də ALLAH yaratmışdır! (Saffat, 96).**

Ancaq bu işlərə qullar nail olarlar. Haqq əhli olan insanların dediyi budur. Cəbriyyə məzhəbi qulun iradəsini büsbütün inkar edirlər.

Mötəziləçi tərəfdarlarına görə isə, **ALLAH** şəri yaratmır, şəri yaradan insandır. Bu iki məzhəbin biri ifrata, o biri isə təfritə* varır. Orta yolu tutmaq isə Sünnə və camaat əhlinin əqidəsidir.

**ALLAH** qullarının gücü çatmayacağını onlara həvalə etməz: ** ALLAH heç kəsi qüvvəsi çatmayan işi [***görməyə***] vadar etməz  (Bəqərə, 286).** Qula bir işin tapşırılması onun buna gücünün çatacağına dəlildir. Qullar ancaq **ALLAH**ın onlara buyurduqlarına cavabdehdirlər.[114]

Bu kainatda cərəyan edən hər bir hadisə ancaq **ALLAH**ın istəyi, elmi, qəzası (hökmü) və qüdrəti ilə baş verir. Onun istəyi bütün istəklərdən üstündür. İstədiyi olur. İnsanlar nə edirlərsə etsinlər, **ALLAH**ın çıxardığı qərarından kənara çıxa bilməzlər. Uca **ALLAH** istədiyi işi icra edir. O, zalımlıqdan uzaqdır. **ALLAH**ın qəza-qədəri ilə baş verən hər şey Onun zülmü deyil, ədalətinin özüdür:

---

* ***Təfrit*** *– bir işə əhəmiyyət verməyərək, onu dəyərsiz etmək. (R.H.)*

[114] *Aşağıdakı cümlələr türk mətnində ixtisar edilmişdir:*

فلو أنهم أطاقوا غيره لكلفهم الله به ، فلما لم يكلفهم بأكثر مما كلفهم به ، دل على أنهم لا يطيقون غيره ، ومعنى (لا حول ولا قوة إلا بالله) أي لا تحول عن المعصية ولا قدرة على الطاعة إلا بمعونة الله تعالى وتوفيقه .

***«Əgər onların başqa bir şeyə gücü çatsaydı, ALLAH onlara bu işləri də yerinə yetirməyi tapşırardı. ALLAHın onlara bacarıqlarından artıq bir şeyi tapşırmaması isə, onların bu işi bacara bilməyəcəklərinə sübutdur. «Allahdan başqa güc və qüvvət sahibi yoxdur» kəlamının açıqlaması isə: Heç kim ALLAHın köməyi və tovfiqi (uğura çatdırması) olmadan, ALLAHa asilikdən uzaq qala bilməz, Ona itaət etməyə güc yetirməz».*** *(R.H.)*

□ ***…Həqiqətən, ALLAH** [heç kəsə]* ***zərrə qədər zülm etməz…*** □ ***(Nisa, 40).***

□ ***Həqiqətən, ALLAH insanlara zərrəcə zülm etməz, lakin insanlar özləri özlərinə zülm edərlər*** □ ***(Yunus, 44).***

Əziz və cəlil olan **ALLAH** hər növ zülm, pislik, eyb və qüsurdan uzaqdır.[115]

## Xülasə

Qiyamət günü yenidən dirilmək, əməllərimizin əvəzinin veriləcəyinə, sorğu-suala çəkiləcəyimizə, haqq-hesab verəcəyimizə, mizan, sirat, Cənnət və Cəhənnəm həqiqətdir. Cənnət və Cəhənnəm yaradılmışdır və amma əbədidir. Hər bir qul, **ALLAH**ın onun üçün müəyyən etdiyinə varid edilir. Qulun bütün işlərini yaradan **ALLAH**dır. İrəlidə təfsilatlı şəkildə izah edildiyi kimi bir şeyə gücü çatmaq iki cürdür. **ALLAH** qullarına gücləri çatmayacağı hər hansı bir işi həvalə etməz.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Qiyamət gününə aid əhvalatlardan nələri bilirsiniz?
2. Cəhənnəm odunun aqibəti haqqında ən doğru baxışlar hansılardır?
3. Xeyir və şəri yaradaraq qədərə aid edən **ALLAH**mıdır?
4. "**ALLAH** insanlara gücü çatmadığından artıq iş həvalə edər" deyənə necə cavab verilməlidir?



[115] *Aşağıdakı ayə türk mətnində ixtisar edilmişdir:*

□لا يسأل عما يفعل وهم يسألون□

□***ALLAH gördüyü işlər barəsində sorğu-sual olunmaz; onlar** [bütün bəndələr]* ***isə** [tutduqları əməllərə görə]* ***sorğu-sual ediləcəklər***□ ***(əl-Ənbiya, 23).*** *(R.H.)*

# İYİRMİ YEDDİNCİ DƏRS

**89. Dirilərin dua və sədəqələrindən ölülər üçün fayda vardır.**

**90. ALLAH duaları qəbul etməklə ehtiyacları ödəyir.**

**91. O, hər şeyin ağasıdır. Lakin heç nə və heç kim Onun ağası deyil. Bir göz qırpımında belə ALLAHa möhtac olmamaq haqqında düşünmək olmaz. Kim ki, göz qırpımı qədər bir müddətdə belə ALLAHa ehtiyacı olmadığını düşünsə, küfrə və həlak olanlar cərgəsinə düşər.**

**92. ALLAH razı qaldığı kimi, qəzəbli də olur. Ancaq ALLAHın razılığı və qəzəbi qulların qəzəbi tutmasına və yaxud razı qalmasına bənzəməz.**

## ŞƏRH

Ölülər dirilərin düasından faydalanırlar. Hədisdə mömin övladın duasının qəbul ediləcəyi xəbər verilmişdir[116]. Ölü, diri insanın uşağı və ya bir başqası olmasından asılı olmayaraq, duadan faydalanar.[117] **ALLAH** duaları qəbul edir. Uca **ALLAH** Kitabında belə buyurur:

***Rəbbiniz buyurdu: «Mənə dua edin, Məndə sizin dualarınızı qəbul edim!...» (Mumin, 60)***[118]

---

[116] *Müslim, Kitabul Vəsiyyə, Babu ma yelhakul-insanə minəs-səvabi badə vəfatihi, (1631); Əbu Davud, 2880.*

[117] *Türk dilinə (**«Ölü yaşayan kimsenin çocuğu olsun veya başkası olsun, duadan yararlanır»**) uyğun çevrilmiş bu cümlə əsərin ərəb orijinalına:*

وكذلك ينتفع الميت بصدقة الحي عنه ، سواء من ولده أو غيره .

*uyğun tərcümə edilməmişdir. Onun düzgün hesab etdiyimiz tərcüməsi aşağıdakı kimidir: **«Ölü, özünün və ya bir başqasının övladı olmasından asılı olmayaraq, diri insanın duasından faydalanar»**. (R.H.)*

[118] *Aşağıdakı cümlə türk tərcüməsində ixtisar edilmişdi:*

وهو الذي يقضي الحوائج لخلقه ، من جلب النفع ودفع الضر، إذ لا يملك الأمر سواه .

**ALLAH** bütün mülkiyyətin sahibidir. Kainatda Onun icazəsi olmadan heç bir qul heç bir şeyin yiyəsi ola bilməz. **ALLAH**a ehtiyacı olmamaq mümkün deyil. Hər bir məxluq öz yaradılışında, varlığında, ruzi qazanmasında, işlərinə tədbir tökməsində, hidayətlənməsində və doğru yola yönəlməsində **ALLAH**a möhtacdır:[119]

□ ***Ey insanlar! Siz ALLAHa möhtacsınız. ALLAH isə [****heç nəyə, o cümlədən sizin ibadətinizə****] möhtac deyildir və hər cür şükrə, tərifə layiqdir*** □ ***(Fatir, 15).***

Kim ki, bir anlığa da belə olsa, **ALLAH**a möhtac olmadığını düşünərsə, küfrə və həlak olanlar cərgəsinə düşər.

Uca **ALLAH** insanlar haram işlətdikcə qəzəblənir, razı qaldığı və əmr etdiyi işlər görülüncə isə razı qalır. Razılıq və qəzəb **ALLAH**ın sifətlərindəndir.

□ ***… ALLAH ona qəzəb və lənət edər…*** □ ***(Nisa, 93).***

□ ***… ALLAH möminlərdən razı oldu…*** □ ***(Fəth, 18).***

Bu hər iki sifət uca **ALLAH**a layiq mənalar verir. Onların keyfiyyətini bilmək və oxşatmağa cəhd etmək mümkün deyildir. Onun razılığı və qəzəbi heç bir ölçüdə insanların razılığına və qəzəbinə bənzəməz:

□ ***…Ona bənzər heç bir şey yoxdur…*** □ ***(Şura, 11).***

---

***«Yaratdıqlarının ehtiyacını onlara xeyir vermək və zərəri dəf etməklə ödəyən Odur. Çünki bu iş Onun ixtiyarındadır».*** *(R.H.)*

[119] *Bu cümlə əsli nüsxədən türk dilinə müxtəsər olaraq çevrilmişdir. Onun orijinala uyğun tərcüməsi aşağıdakı kimidir:*

فكل مخلوق محتاج إلى الله – تعالى – في خلقه وإيجاده ورزقه وتدبير أموره ، هدايته وإرشاده ، كما قال – تعالى –:

***«Hər bir məxluq öz yaradılışında, varlığında, ruzi qazanmasında, işlərinə tədbir tökməsində, hidayətlənməsində və doğru yola yönəlməsində ALLAHa möhtacdır».*** *(R.H.)*

## Xülasə

İnsanların dua və sədəqələri ölülər üçün faydalıdır. **ALLAH** duaları məmnuniyyətlə qəbul edən və onlara cavab verəndir. **ALLAH** yerdəki və göylərdəki mülkiyyətin sahibidir. Hər hansı bir varlıq üçün Ona möhtac olmama mübahisə mövzusu ola bilməz. Qəzəb və razılıq **ALLAH**ın zatına məxsus sifətləridir. Sünnə əhli buna inanır.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Ölü, dirinin sədəqə və duasından faydalanırmı?
2. **ALLAH**a möhtacı olmadığını zənn edənə hansı hökm var?
3. Qəzəblənmək və razı olmaq **ALLAH**ın sübuta yetmiş sifətlərindəndirmi?



# İYİRMİ SƏKKİZİNCİ DƏRS

**93. ALLAHın Elçisinin** (s.ə.s.) **əshabələrini sevərik. Onların hər hansı birini sevməkdə ifrata yol verməz və onların heç birindən iraq[120] olduğumuzu söyləmərik. Onları sevməyəni və onlar haqqında pis düşünənləri sevmərik. Onları ancaq xeyirxahlıqla yada salarıq. Onları sevmək din və imandır, yaxşılıqdır. Onlara qarşı çıxmaq ayrı-seçkilik salmaq, küfr, nifaq və azğınlıqdır.**

**94. ALLAHın Peyğəmbərindən** (s.ə.s.) **sonra ilk xəlifənin, fəziləti və İslamda olan öncüllüyü ilə Əbu Bəkr Siddiq** (A.o.r.) **olduğuna, sonra Ömər ibn-Xəttab** (A.o.r.)**, sonra Osman b. Əffan** (A.o.r.) **və sonra da Əli** (A.o.r.) **olduğuna inanırıq. Onların dördü də raşidi (haqq) xəlifələr və doğru yol göstərən imamlardır.**

## ŞƏRH

**ALLAH**ın Peyğəmbərinin (s.ə.s.) səhabələrini, **ALLAH**ın Elçisinə (s.ə.s.) olan məhəbbətimizə və Onun da (s.ə.s.) səhabələrini sevdiyinə görə sevirik. Onları sevməkdə hər hansı birinə üstünlük vermirik. Rafizilərin[121] Əli b. Əbu Talibi (A.o.r.) üstün[122] tutduqları kimi. Onlar o dərəcədə ifrata varırlar ki, az qala Onu (A.o.r.) ilahlıq səviyyəsinə qaldırsınlar. Biz belə ifrata yol vermirik. Yenə də biz səhabələrin hər hansı birindən uzaq olduğumuzu demirik. Biz onların, insanların imanı və xeyirxahlıqlarında ən yetgin, cihad və itaətdə də ən yüksək olduqlarına inanırıq.

Səhabəni sevməyəni sevmirik. Onları sevməmək nifaq və rəzillik əlamətidir. Onları xeyirxahlıqla anmayanları sevmərik.

---

*[120] Tərcümədə göstərdiyimiz "iraq" sözü yerində türk mətnində "bəri" sözü verilmişdi ki, onun da ərəbcə "pak", "təmiz", "bəraət qazanmış", "günahsız", "kənar", "iraq", "azad" və. s. mənaları vardır. Cümlənin məntiqi ilə bağlı məhz "iraq" sözünü seçdik (F.S.).*

*[121] Rafizilər – şiələrin mənsub olduğu radikal təriqətdir (F.S.).*

*[122] Digər üç rəşidi xəlifə imamlardan (F.S.).*

Biz səhabələri yalnız xeyirxahlıqla yad edərik. **ALLAHın** Peyğəmbəri (s.ə.s.) onları sevmişdir və bizə də onları sevməyi tövsiyyə etmişdir. Onları sevmək dinin sağlamlığı, imanın və yaxşılığın əlamətidir. Onları sevməmək, küfrün, nifaqın, rəzilliyin və azğınlığın əlamətidir.[123]

**ALLAHın** Peyğəmbərindən (s.ə.s.) sonra ilk xəlifə kimi, ümmətin fəzilətlisi və xeyirlisi olan Əbu Bəkri (A.o.r.) görürük. Çünki **ALLAHın** Peyğəmbəri (s.ə.s.) özünün bir çox hədislərində onun xəlifəliyinə işarə etmişdir. O, ümmətin xəlifəsi olmağa ən layiqli olan insan idi. Müsəlmanlar Səqifə günü hamılıqla ona biyət etdilər. Ondan sonra Öməri (A.o.r.) xəlifə kimi tanıyırıq. Çünki onu da Əbu Bəkr (A.o.r.) xəlifəliyə tövsiyyə etmişdir. Onların hər ikisi də **ALLAHın** Peyğəmbərinin (s.ə.s.) səhabələridir. Onların ardıyca Osman b. Əffan (A.o.r.) xəlifə olmuşdur. O, **ALLAHın** Peyğəmbərinin (s.ə.s.) iki qızının əri idi. Bunlardan sonra Peyğəmbərin (s.ə.s.) qızı Fatimənin (A.o.r.) əri Əli b. Əbu Talibi (A.o.r.) xəlifə kimi tanıyırıq. Bu dörd xəlifə səhabələrin ən fəzilətliləridir. Onlar raşidi xəlifələr və **ALLAHın** Peyğəmbərinin (s.ə.s.), sünnələrinə riayət etməyimizi əmr etdiyi doğru yolun imamlarıdır.

**95. ALLAHın Peyğəmbərinin** (s.ə.s.) **Cənnətlə müjdələdiyi on səhabənin cənnətlik olduqlarına biz də şahidlik edirik. Əbu Bəkr** (A.o.r.)**, Ömər** (A.o.r.)**, Osman** (A.o.r.)**, Əli** (A.o.r.)**, Təlhə** (A.o.r.)**, əz-Zübeyr** (A.o.r.)**, Səd** (A.o.r.)**, Səid** (A.o.r.)**, Abdurrəhman b. Auf** (A.o.r.)**, ümmətin əmini Əbu Ubeydə İbn Cərrah** (A.o.r.) **Cənnətlə müjdələnən on səhabədir.**

**96. Kim Peyğəmbərin** (s.ə.s.) **səhabələrini və Onun təmiz və mübarək xanımlarını bütün pisliklərdən pak bilir və uzaq görürsə, özünü nifaqdan qorumuş olur**.[124]

---

[123] *Aşağıdakı cümlə türk mətnində ixtisar edilmişdir:*

نعوذ بالله من الضلالة بعد الهدى

*«Hidayətdən sonra zəlalətə düşməkdən ALLAHa sığınırıq». (R.H.)*

[124] *Bu cümlə türk mətninə (**«Kim Rasulullah -Sallallahu Aleyhi Vesellem-in Ashabını ve Onun temiz ve mübarek hanımlarını tüm kötülüklerden tenzih***

# ŞƏRH

**ALLAH**ın Elçisinin (s.ə.s.) əshabələrindən on nəfəri Cənnətlə müjdələdiyinə iman gətiririk. Çünki o, belə demişdir: "Əbu Bəkr Cənnətdədir. Ömər Cənnətdədir..."[125].

Kim **ALLAH**ın Elçisinin (s.ə.s.) səhabələrini, Onun iftiralardan uzaq pak xanımlarını və tabe olunmalarını əmr etdiyi mübarək nəslini (əhli beytini) bütün pisliklərdən uzaq bilərsə və haqlarında gözəl sözlər söyləyərsə, özünü nifaqdan qorumuş olur

# Xülasə

Səhabələri ifrata varmadan və nöqsansız sevərik, onların haqlarını və fəzilətlərini tanıyırıq. Dörd xəlifənin xəlifə olma sırasını və sıraya görə bu səhabələrin ən fəzilətliləri olduqlarına inanırıq. **ALLAH**ın Peyğəmbərinin (s.ə.s.) Cənnətlə müjdələdiyi on səhabənin haqlarını və fəzilətlərini tanıyırıq. **ALLAH**ın Peyğəmbərinin (s.ə.s.) əhli beytini və zövcələrini də sevir və ehtiram bəsləyirik. Kim onlara böhtan deyərsə, onu münafiq sayarıq.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Səhabələrlə bağlı vəzifələrimiz nədən ibarətdir?
2. Peyğəmbərin (s.ə.s.) əhli beyti və zövcələri haqqında nə bilirsiniz?
3. Səhabələrə böhtan deyənlər barədə nə düşünürsünüz?



---

***edip uzak görürse, nifaktan korunmuştur»)** müxtəsər olaraq çevrilmişdir. Onun orijinala uyğun tərcüməsi aşağıdakı kimidir:*

ومن أحسن القول في أصحاب رسول الله ، صلى الله عليه وسلم ، وأزواجه الطاهرات من كل دنس وذرياته المقدسين من كل رجس ، فقد برىء من النفاق .

***«Kim Peyğəmbərin** (s.ə.s.) səhabələrini, **Onun pak xanımlarını və mübarək nəslini bütün pisliklərdən uzaq bilərsə və haqlarında gözəl sözlər söyləyərsə, özünü nifaqdan qorumuş olur».** (R.H.)*

[125] *Səhih Sünən Əbu Davud, 4649.*

# İYİRMİ DOQQUZUNCU DƏRS

**97. Əvvəlki sələf alimləri, onlardan sonra gələn tabeinlər, salehlər, hədisləri rəvayət edənlər, fiqh alimləri və mütəfəkkirlər ancaq gözəllik və xeyirxahlıqla anılırlar. Kim ki, onları bədxahlıqla yada salırsa, o, möminlərin yolu ilə getmir.**

**98. ALLAHın dostu[126] olan qullarından hər hansı birisini peyğəmbərlərdən (əleyhissəlamlardan) üstün tutmuruq. Biz deyirik ki, təkcə bir peyğəmbər vəlilərin hamısından daha fəzilətlidir.**

**99. Onların (vəli qulların) etibarlı İslam alimlərindən səhih rəvayət edilən kəramətlərinə inanırıq.**

## ŞƏRH

Səhabə və tabeinlərdən olan əvvəlki alimləri, salehləri, hədis rəvayətçilərini və faqihləri ancaq hüsnürəğbətlə yada salırıq. Kim ki, onları bədxahlıqla yad edərsə, deməli o zəlalət yolunu seçmişdir. O alimlərimizi sevmək bizə vacibdir. Onların qiybətini qıranlar isə bilməlidir ki, onların ətləri zəhərlidir!

Vəliləri əsla peyğəmbərlərdən üstün tutmarıq. İbn Ərəbi və ona bənzər zəlalət əhli, vəliləri peyğəmbərlərdən üstün tutanlardır. Biz bir peyğəmbərin bütün vəlilərdən daha üstün olduğuna inanırıq. Çünki uca **ALLAH** onları qullarının içindən seçib peyğəmbərlik və hikmət vermişdir. Əziz və cəlil **ALLAH** Kitabında belə buyurur:

*** ALLAH mələklərdən də peyğəmbərlər seçər, insanlardan da  (Həcc, 75).***

Övliyaların kəraməti haqqında rəvayət edilmiş səhih hədislərə inanırıq. Kəramət **ALLAH**ın saleh qullarına xariqəladə işləri görmələri üçün bəxş edilmişdir. Sabit və dəqiq olmayan

---

[126] *Əsərin türk mətnində: **vəli** (F.S.).*

rəvayətləri rədd edirik. Bunların əsli haqqında **ALLAH**ın Kitabında deyilmişdir.

 ***Zəkəriyya hər dəfə Məryəmin ibadət etdiyi mehraba girdikdə, onun yanında bir rüzi olduğunu görərdi.*** *[Zəkəriyya:]* ***"Ya Məryəm, bunlar sənin üçün haradandır?" – dedikdə, o: "ALLAH tərəfindəndir!" – deyə cavab verərdi (Ali-İmran37).***

**ALLAH**ın bəzi vəli qulları haqqında bizə çatan kəramətlər o vəli qullardandır. Amma bir də Şeytanın dostları vardır ki, onların haqqında uydurulan "kəramətləri" qəbul etmirik.

## Xülasə

Saleh sələflərin bütün alimlərini ancaq xeyirxahlıqla yada salarıq. Vəliləri peyğəmbərlərdən (əlehissəlamlardan) üstün tutmarıq. Övliyaların kəramətlərinə inanırıq.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Saleh sələflər haqqında baxışımız necə olmalıdır?
2. Vəliləri (**ALLAH**ın mömin dostlarını) peyğəmbərlərdən üstün tutmaq olarmı?
3. Vəlilərin kəraməti nədədir? Bunun caiz olduğuna dair bir sübut gətirin.



# OTUZUNCU DƏRS

**100. Dəccalın üzə çıxması, Məryəm oğlu İsa əleyhissəlamın göydən enməsi kimi Qiyamət əlamətlərinə inanırıq. Günəşin Qərbdən çıxacağına, heyvanın olduğu yerdən çıxacağına da inanırıq.**

**101. Heç bir kahini (mediumu) və ya falçını, ya da ki, Quran, Sünnə və ümmətin rəyinə zidd iddiada olan kimsələri doğrultmayacağıq.**

## ŞƏRH

Qiyamət saatının əlamətlərinin olduğuna və bu əlamətlərinin üzə çıxmasıyla Qiyamət saatının yaxınlaşacağına inanırıq. **ALLAH**ın Peyğəmbəri (s.ə.s.) bunu hədislərində xəbər vermişdir.

*"Siz on əlamət görmədən qiyamət qopmayacaq. Bundan sonra Dəccalı, heyvanın olduğu yerdən çıxacağını, günəşin qərbdən doğacağını və İsa əleyhissəlamın göydən yerə enəcəyini bildirdi"*[127].

Bunlar Qiyamətin böyük əlamətlərindəndir. Bunlardan başqa kiçik əlamətləri də vardır.

Qeybi bildiyini söyləyən nə hər hansı bir baxıcını, və nə də falçını (sehrbazı) doğru sayıb təsdiqləmərik. Çünki əziz və cəlil olan **ALLAH:** □ ***…Heç kəs səhər nə edəcəyini bilməz…*** □ ***(Loğman, 34)*** buyurur. Yenə də bir başqa kərim ayədə belə buyurulur:

□ ***[Ya Məhəmməd!] De ki: "ALLAHdan başqa göylərdə və yerdə olan heç kəs qeybi bilməz*** □ ***(Nəml, 65).***

**ALLAH**ın Peyğəmbəri də (s.ə.s.) belə buyurur:

*"Kim bir falçı və ya baxıcının (mediumun)* yanına gedərək, onun dediklərinə inanarsa, Məhəmmədə endiriləni inkar etmiş olur"*[128].

---

[127] *Müslim, Kitabul-Fitən, 4/315, İbn Macə, 2/258.*

Bir də, **ALLAH**ın Kitabına, Peyğəmbərin (s.ə.s.) Sünnəsinə və ümmətin rəyinə zidd gedən kimsələrin baxışlarını, onlar kim olursa olsun, qəbul etmərik.

## Xülasə

Qiyamətin böyük və kiçik əlamətlərinə inanırıq. (Guya "qeybdən" xəbər verən) kahinləri və baxıcıları, habelə Qurana, Sünnəyə və ümmətin rəyinə qarşı çıxanları rədd edirik.

## Mövzunun aydınlaşdırılması üçün suallar

1. Qiyamətin dörd əlamətini yada salın.
2. Kahin və falçının dediklərinə inananın hökmü nədir?



---

[*] ***Medium –*** *ruhların vasitəsi ilə "qeybdən" xəbər verən şəxs (F.S.).*
[128] *ət-Tirmizi, 2155; əl-Hakim, 1/36.*

# OTUZ BİRİNCİ DƏRS

**102. Camaat olmağı haqlı və doğru, təfriqəçiliyi isə yoldan sapma və əzab kimi görürük.**

**103. ALLAHın yer üzündəki dini ilə səmadakı dini eynidir. O da İslamdır. Əziz və cəlil ALLAH Quranda belə buyurur:** *** ALLAH yanında [*haqq olan*] din, əlbəttə, İslamdır (Ali-İmran, 19).  …sizin üçün din olaraq İslamı bəyənib seçdim…  (Maidə, 3).***

**104. ALLAHın dini** ifrata varma ilə **onun əksi olan əksiltmələr arasında** (ədalətli və seçilmiş**), təşbihlə (ALLAH**ın sifətlərini yaradılmışlara bənzətmə**) tətil (ALLAH**ın sifətlərini inkar etmə**), cəbrlə qədər, qorxuyla (**yə ya arxayınçılıqla – red.) **ümüd arasında** (ədalətli və seçilmiş**) bir yoldur.**

## ŞƏRH

Camaat olmağın haqlı, doğru və düzgün yol, bu kəslərin nicat tapanlar dəstəsi və onların **ALLAH**ın Peyğəmbərinin (s.ə.s.) qoyduğu yolda olanlar olduğuna inanırıq. Başqa dəstələr zəlalət yolunu tutanlardır. Onların yolu haqq yoldan çıxma və haqqı tərk edərək, başqa yol seçməkdir. Bu yol dünyada da, axirətdə də əzab yoludur. Çünki əziz və cəlil **ALLAH** Quranda belə buyurur:

*** Bu, şübhəsiz ki, Mənim doğru yolumdur. Onu tutub gedin. Sizi ALLAHın yolundan sapdırıcıq yollara uymayın. ALLAH sizə bunları tövsiyyə etdi ki, bəlkə, pis əməllərdən çəkinəsiniz! (Ənam, 153).***

**ALLAH**ın dini birdir. O da İslamdır:

*** Allah yanında [haqq olan] din, əlbəttə, İslamdır  (Ali-İmran, 19).***

*** …sizin üçün din olaraq İslamı bəyənib seçdim…  (Maidə, 3).***

İslam **ALLAH**ın yeganə haqq dinidir. **ALLAH** bütün peyğəmbərlərini insanlara İslam[129] dini ilə göndərmişdir. İslam, şəriətə əsasən **ALLAH**a ibadət etməkdir. İslamla göndərilmiş olmayan heç bir peyğəmbər yoxdur. Yəqubun (ə.) uşaqları: ***…tək ALLAHa təslim[130] olub, ona ibadət edəcəyik!" – dedilər (Bəqərə, 133).*** Musa əleyhissəlam da belə demişdir: ***Ey qövmüm! Əgər ALLAHa iman gətirmisinizsə və təslim olmusunuzsa, ona təvəkkül edin! (Yunus, 84).*** Bəlqis: ***Ey Rəbbim! Mən*** *[günəşə sitayiş etməklə]* ***özümə zülm etmişdim. Mən artıq Süleyman vasitəsilə aləmlərin Rəbbinə təslim oldum (Nəml, 44)*** demişdir. İsa əleyhissəlamın həvvariləri[131] belə demişdilər: ***Biz ALLAHa inandıq. Sən də ALLAHa təslim olduğumuza şahid ol! (Ali-İmran, 52).***

İslam orta (tarazlıqda) bir dindir:

***Beləliklə də, sizi orta [ədalətli və seçilmiş] bir ümmət etdik (Bəqərə, 143).***

İslam ibadətdə ifrata varma ilə onun əksi olan əksiltmələr arasında orta (ədalətli və seçilmiş) bir dindir. Bu din peyğəmbər haqqında da orta (ədalətli və seçilmiş) bir yoldur. Bu yolda nə ifrata varma və nə də dini əksiltmə yoxdur.

İslam **ALLAH**ın sifətləri haqqında orta (ədalətli və seçilmiş) bir yol tutumuşdur. İslamın tərəfdarı olmaq – **ALLAH**ı, yaratdıqlarına bənzətməklə (əstəğfirullah) **ALLAH**ın sifətlərini inkar etmə, insanın iradəsini tamamilə yox sayan cəbriyyəçilərlə insanı əməllərinin yaradıcısı kimi qəbul edən qədəriyyəçilər arasında orta (ədalətli və seçilmiş) bir yol tutmaq deməkdir.

---

[129] *Müəllif burada **ALLAH**ın peyğəmbərlərə nazil etdiyi bütün dinlərin əsasında insanları təkallahlığa çağırışının, yalnız tək olan Rəbbə ibadətin və təslimin qoyulduğunu bildirmək istəyir. Məhz insanın bütün varlığı ilə **ALLAH**a təslim olması Quranda (ərəbcə) **İSLAM** adlandırılmışdır (F.S.).*

[130] ***Təslim və islam*** *eyni lüğəti mənaya malik sözlərdir. İqtibasda adı çəkilən peyğəmbərlərə (Allahın onlara salamı olsun) İslam dininin nazil edilməsi Qurani-Kərimdə aydın şəkildə təsdiq olunur (F.S.).*

[131] ***Həvvarilər*** *– "əshabələr" mənasında (F.S.).*

İslam, **ALLAH**ın imtahanından qorxmaqla (yəni, insanın sınağa çəkilməyəcəyinə arxayın olması ilə – red.), Onun mərhəmətindən ümid kəsməmək arasında bir yoldur.



# OTUZ İKİNCİ DƏRS

**105. Məhz bu, zahirdə və daxildə bizim dinimiz və etiqadımızdır. Bu söylədiklərimizi inkar edən və yaxud Ona qarşı çıxanlardan uzaq olaraq Allaha sığındığımızı ifadə etməliyik. Allahdan istədiyimiz odur ki, bizi imanda möhkəm etsin və həyatımıza bununla son versin. Bizi hər cür istəklərə uymadan və ziddiyyətli nəzər nöqtələrindən, rəzil və bayağı yollara düşməkdən qorusun. Müşəbbihçilik, mötəziçilik, cəhmiyyəçilik, cəbriyyəçilik, qədəriyyəçilik və sairə kimi, bizi də Sünnə və camaata qarşı çıxanlardan etməsin. Biz onlardan uzağıq. Bizə görə onlar yoldan çıxmış və bayağıdırlar. Qoruyan və müvəffəqiyyətə çatdıran ALLAHdır.**

## ŞƏRH

Biz bu əsərimizdə qısaca olaraq dinimizin və əqidəmizin necə olduğunu açıqladıq. Kitabımızda dilə gətirdiklərimizin hamısı aşkarda və daxildə bizim əqidəmizdir. Biz, gizli saxladıqlarının əksini üzə çıxardanlardan deyilik. Anlatdıqlarımıza qarşı olan hər sözdən və onların əleyhinə rəftar edən hər kəsdən **ALLAH**a sığınırıq.

**ALLAH**ın Peyğəmbərinin (s.ə.s.) buyurduğu kimi, Ondan bizi dinində möhkəm etməsini diləyirik:

*"Ey qəlbləri dəyişdirən! Qəlbimi dinində möhkəmlət!"*[132]

Rəbbimizdən dilədiyimiz odur ki, bizi istəklərə uymanın hər növündən, pozğun düşüncələrdən, etiqadın ziddinə yönəldilmiş sözlər və nəzər nöqtələrindən, müşəbbihçilik, mötəziçilik,

---

[132] *Əhməd, Müsnəd, 4/182; İbn Macə,əl-Mukaddimə, 1/72 (199); əl-Hakim, əl-Müstədrək, 1/525; əl-Acurri, əş-Səriyyə, səh. 317; İbn Məndə, ər-Rəddu ələl-Cəhmiyyə, səh. 87. Hamı bu hədisi ən-Nəvvas b. Səmandan rəvayət edir. Hədisin keçdiyi yollar Müslimin şərtlərinə müvafiqdir. Buxari və Müslim bunu rəvayət etməyiblər. İbn Məndə ən-Nəvvas b. Səmanın hədisinin "məşhur" olduğunu və onu bir çox hədis imamlarının söylədiklərini deyir. Heç biri tədqiq etməmişdir.*

cəhmiyyəçilik, cəbriyyəçilik, qədəriyyəçilik və sairə kimi yollarını azmış məzhəblərin şərindən qorusun! Onların hamısı Sünnə və müsəlmanların haqlı olan camaatının əleyhinə gedərək, zəlalətə düşdülər və zəlalət firqələriylə əlbir olaraq onların baxışlarını yaydılar. Biz onlardan olmadığımızı açıqca elan edirik. Çünki müsəlmanın küfr və bidət əhlindən olmadığını aydın şəkildə bəyan etməsi lazımdır. Onların isə zəlalət çirkabında olduqlarını, pozğun baxışlara, düşüncələrə və nəzər nöqtələrinə yiyələndiklərini söyləyirik.

Qoruyan və uğura çatdıran **ALLAH**dır**. ALLAH**ın saləti və salamı olsun Onun Elçisi Məhəmmədə (s.ə.s.)!

Son duamız:

*"Aləmlərin rəbbi **ALLAH**a həmd olsun!"*



